DOI: https://doi.org/10.36719/2706-6185/14/5-12

**Cavadxan Yusif oğlu Qasımov**
Naxçıvan Dövlət Universiteti
iqtisad üzrə fəlsəfə doktoru
cavadxan.yusifoglu@ndu.edu.az

# QARABAĞ İQTİSADİ RAYONUNUN BƏRPA OLUNMASI DAVAMLI İQTİSADİ İNKİŞAF GÖSTƏRİCİSİDİR

**Xülasə**

Məqalədə, Azərbaycan Respublikasının milli iqtisadiyyatının uzunmüddətli perspektivləri müstəvisində olan tədbirlərdən söz açılmışdır. Bu sahədə, 44 günlük Vətən mübaribəsində Zəfər qazanan ölkəmizin işğaldan azad olunan ərazilərin bərpa və abadlaşdırma işlərindən bəhs olunmuşdur. Qeyd olunmuşdur ki, milli iqtisadiyyat üçün həmin əraizlərin iqtisadi potensialı böyükdür və xüsusilə də, bu sahədə, Qarabağ və Şərqi Zəngəzur iqtisadi rayonları zəruri əhəmiyyətə malik olacaq. İstər hüquqi, istərsə də, iqtisadi sahələr üzrə həyata keçirilən tənzimləmələrlə işğaldan azad olunan bütün ərazilər kimi Qarabağ iqtisadi rayonunun da makroiqtisadi prioritetlərin reallaşmasındakı rolunun artması barəsində bəhs olunmuşdur. Eyni zamanda, göstərilmişdir ki, Qarabağ, hazırda ərazilərin minalardan təmizlənməsi, bərpa-quruculuq işlərinin başlanması, sağlam və etibarlı yaşayış üçün infrastruktur təminatının yaradılması ilə yenidən qurulmaqdadır. Məhz bu mənada, Qarabağda investisiya layihələrinin reallaşmasından, ağıllı şəhər təsisatlarının yaradılmasından və nəticə etibarı ilə daha abad bir ərazinin formalaşmasından bəhs olunmuşdur.Məqalədə aparılan təhlillər diaqramlar və cədvəllərlə təqdim olunur.

***Açar sözlər:*** *Qarabağ iqtisadiyyatı, ağıllı şəhər, iqtisadi rayon, uzunmüddətli perspektivlər, makroiqtisadi inkişaf*

**Cavadkhan Yusif Gasimov**
Nakhchivan State University
PhD in economics
cavadxan.yusifoglu@ndu.edu.az

## The restoration of the Karabagh economic region is an indication of continuous economic development

**Abstract**

The article talks about the measures in the long-term prospects of the national economy of the Republic of Azerbaijan. In this area, the restoration and improvement works of the territories freed from occupation of our country, which won Victory in the 44-day Patriotic War, were discussed. It was noted that the economic potential of those regions is great for the national economy, and in particular, in this area, the economic regions of Karabakh and Eastern Zangezur will be of necessary importance. It was discussed about the increase of the role of the Karabagh economic region in the realization of macroeconomic priorities, as well as all territories freed from occupation by the regulations implemented in both legal and economic fields. At the same time, it has been shown that Karabagh is currently being reconstructed by cleaning the territories from mines, starting restoration and construction works, and creating infrastructure provision for healthy and safe living. In this sense, the implementation of investment projects in Karabagh, the creation of smart city institutions and, as a result, the formation of a more prosperous area were discussed.The analyzes carried out in the article are presented with diagrams and tables.

***Keywords:*** *Karabagh economy, smart city, economic region, long-term perspectives, macroeconomicdevelopment*

## Giriş

Qarabağ iqtisadi rayonu ölkənin tarixi ərazisi, milli iqtisadi inkişaf göstəricisi və sosial dayanıqlılıq ifadəsidir.

Azərbaycan Respublikasının müstəqilliyinin ilk illərində tarixi düşmənlərimiz ermənilərin

torpaqlarımıza etdikləri təcavüz ərazimizin 20 faizinin işğal olunması, bir milyondan artıq vətəndaşın isə qaçqın vəziyyətinə düşməsinə səbəb oldu. Bu zaman, iqtisadiyyata güclü ziyan dəymiş, təbii resurslarımız, maddi mədəniyyət nümunələrimiz dağıdılmış, soyqırım və faciələr törədilmişdir. Acı həqiqətdir ki, Qarabağ ərazisində 1988-1993-cü illərdə, bütövlükdə, 900 yaşayış məntəqəsi, 150 min ev, 7 min ictimai bina, 693 məktəb, 855 uşaq bağçası, 695 tibb müəssisəsi, 927 kitabxana, 44 məbəd, 9 məscid, 473 tarixi abidə, saray və muzeylər, 40 min muzey eksponatı, 6 min sənaye və kənd təsərrüfatı müəssisəsi, 160 körpü və digər infrastruktur obyektləri dağıdılıb (1).

2021-ci ilin məlumatlarına əsasən Qarabağ iqtisadi rayounun sahəsi 8,99 min km2, əhalisinin sayı 904,5 min nəfər təşkil etmişdir. Qeyd etmək olar ki, 44 günlük Vətən müharibəsindən sonra işğaldan azad olunan ərazilərin ölkənin milli iqtisadiyyatı üçün perspektivlərinin nəzərə alınması daha müasir dəyərlər əsasında iqtisadi inkişafı təmin etməkdədir. İftixarla qeyd etmək olar ki, məhz yeni tənzimləmə ilə Vətən müharibəsində qazandığımız qürurverici Zəfərin işığında:

– sosial-iqtisadi inkişafın səmərəliliyindən;
– modernləşmə fonunda kəndlərin, qəsəbələrin, şəhərlərin və rayonların abadlaşmasından;
– etibarlı investisiya mühitinin əsaslarından;
– zəruri infrastruktur təminatının yaradılmasından;
– səmərəli məskunlaşmanın və tarixi Qayıdışın təşkilindən;
– iqtisadi potensialdan, təbii sərvətlərdən istifadə imkanlarından;
– yeni prioritetlər istiqamətində turizm imkanlarından istifadə olunmasından ibarət proseslər daha geniş əhatədə olmaqla qətiyyətlə reallaşacadır.

Bununla da, ölkədə yeni reallıqlar və hədəflər müstəvisində görülən məqsədyönlü işlərdən biri olaraq, mövcud olan 10 iqtisadi rayon ölkə başçısının 7 iyul 2021-ci il tarixli Fərmanı əsasında yeni bölgü ilə hazırda 14 olaraq təsdiq olunmuşdur. Həmin bölgü nəticəsində Qarabağ və Şərqi Zəngəzur iqtisadi rayonları da təsdiq olunmuşdur. Yeni bölgü ilə Qarabağ iqtisadi rayonu Xankəndi şəhəri, Ağcabədi, Ağdam, Bərdə, Füzuli, Xocalı, Xocavənd, Şuşa və Tərtər rayonlarını əhatə etməkdədir. Şərqi Zəngəzur iqtisadi rayonu isə Cəbrayıl, Kəlbəcər,Qubadlı, Laçın və Zəngilan rayonlarını özündə birləşdirmişdir (2).

Qeyd edək ki, Qarabağ iqtisadi rayon özünün əlverişli təbii şəraitinə və müxtəlif təbii ehtiyatlara malik olmasına görə seçilməkdədir. Burada suvarma, dəmyə əkinçiliyi, bağçılıq və heyvandarlıq üçün geniş imkanlar vardır ki, bu da əhatəli təsərrüfatçılıq fəaliyyətinə və aqrar sektor üçün səmərəli məşğulluq imkanlarına əsas verməkdədir. Hələ keçmiş İttifaq dövründə xalqımızın ümummilli lideri Heydər Əliyevin qayğı və diqqəti ilə 1976-cı ildə Tərtər çayı üzərində gücü 72 min kvt olan Sərsəng SES və su anbarı tikilmiş, məhsuldarlığın artmasına hesablanan kanallar çəkilmişdir. Müasir makroiqtisadi inkişafın hərəkətverici qüvvəsinə çevrilən qeyri-neft sektorunun dayanıqlılığı məhz bu amilin də sayəsində mühüm əhəmiyyət daşıyır. Digər tərəfdən, bəhs olunan potensial iqtisadi rayonda və ona yaxın olan ərazilərdə əkin sahələrinin suvarma suyuna olan təminatına etibarlılıq deməkdir.

Milli ordumuzun zəfər yürüşləri müasir iqtisadi şəraitin hazırkı mərhələsində müəyyən olunan uzunmüddətli prioritetlərə təminat verəcəkdir. Bu, təbii ehtiyatların qiymətləndirilməsi və səmərəli istifadə sahəsində daha əlamətdar olacaq. Aydındır ki, Qarabağ iqtisadi rayonunda mühüm təbii sərvətlər olaraq, Mehmana polimetal filiz yatağı, həmçinin bir sıra tikinti materialları və üzlük daş, mərmər, gil, gəc və s. qeyri-filiz yataqları mövcuddur (Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı, 2007: 254). Təbii ki, burada, porfirit, əhəngdaşı, sement xammalı da ərazinin iqtisadi mahiyyətini daha da artıran amillər kimi çıxış etməkdədir. Ərazidə mövcud olan Turşsu və Şırlan kimi karbohidrogenli mineral bulaqları iqtisadi rayon üçün həm də İlahi möcüzə olaraq ərazinin turizm əhəmiyyətli perspektivləri daha da artırmaqdadır.

Tarixi ərazilərimiz iqtisadi potensialı ilə seçilməkdədir. Hələ XX əsrin əvvəllərində Qarabağda baramaçılıq təşəkkül tapmış, Şuşada ipək sarıma fabriki fəaliyyət göstərmiş, həmçinin xalça palaz məmulatı inkişaf etmişdir (Allahverdiyev, 1991: 40-41). Bunlarla yanaşı, həmin ərazilərdə infrastruktur göstəriciləri də etibarlılığı ilə seçilirdi. Xüsusilə, Xankəndi və Şuşa şəhərlərdə elektron, elektrotexnika, cihazqayırma, radiotexnika sənaye müəssisələrinin filialları fəaliyyət göstərmişdir (Allahverdiyev,1991: 73). Qarabağ iqtisadi rayonunda yeyinti sənayesinin inkişafında şərabçılıq, meyvə-tərəvəz konservi, unüyütmə, çörəkbişirmə mühüm rola malikdir. Bu, yüngül sənaye üzrə pambıqtəmizləmə, toxuçuluq, ipək, xalçaçılıq, ayaqqabı istehsalı ilə ifadə olunmaqdadır. Xankəndidə maşınqayırma qovşaqlarının, Ağdamda maşınqayırma mərkəzlərinin mövcud olması, Zəngilan rayonunda sement

xammalı, Füzulidə kərpic istehsalının təşəkkül tapması mövcud sosial-iqtisadi perspektivləri daha da artırmaqda idi (Allahverdiyev, 1991: 84-103-108).

Təbii ki, bu potensial iqtisadiyyatın aparıcı sahələrinin bir-biri ilə əlaqəliliyi şəraitində, daha doğrusu, onun mezoiqtisadi səmərəliliyini artırmaqla ASK inteqrasiyası mexanizmləri ilə daha da əlamətdar olmaqdadır. Eyni zamanda, hazırda aparılan iqtisadi islahatlar regionlarda sənayeləşmə proseslərinin səmərəli təşkili və idarə olunması sahəsində strateji əhəmiyyəti ilə seçilir ki, bu da işğaldan azad olunan ərazilərin sosial-iqtisadi perspektivlərini daha da artırır.

Qarabağ iqtisadi rayonu ölkənin milli iqtisadiyyatı üçün aktual olan istiqamətlərin perspektivliliyinə malik olmaqla, onun uzunmüddətli prioritetlərinə xidmət edəcəkdir. Burada, xüsusilə, tikinti materialları (mərmər, sement xammalı, tikinti daşı) ərazinin zəruri yeraltı resurları olaraq qeyd oluna bilər. Bu iqtisadi rayon iqtisadiyyatın aparıcı sahəsi olaraq sənayenin inkişafı üçün yüksək perspektivlərə malikdir. Belə ki, burada, meşələrdə olan ağac ehtiyatı imkanları yerli tələbatları tam olaraq qarşılayır. Həmçinin sənaye sahəsində yüksək məhsuldarlıq göstəriciləri içərisində yerli xammal üçün emal nəzərdə tutan yüngül, yeyinti və tikinti materialları sənayesi yer almaqdadır. Təbii olaraq, yeyinti sənayesinin inkişafında şərabçılıq, meyvə tərəvəz konservi, unüyütmə, çörəkbişirmə, yüngül sənaye pambıqtəmizləmə, toxuculuq, ipək, xalçaçılıq ayaqqabı istehsalı mühüm rol oynamış olur.

Eyni zamanda, iqtisadi rayonun sosial-iqtisadi inkişafında kənd təsərrüfatının rolu böyükdür. Bu istiqamət üzrə aparıcı sahələrin ardıcıllığında üzümçülük, bağçılıq, pambıqçılıq, heyvandarlıq və arıçılıq sahələrini görə bilərik. Bununla yanaşı, ərazidə baramaçılığın inkişafı üçün imkanlar vardır. Mezoiqtisadi əhəmiyyətlilik baxımından iqtisadi rayonun üstünlükləri içərisində sənayenin səmərəliliyini dəyərləndirmək olar. Belə ki, burada sənayenin çoxistiqamətli perspektivlərindən bəhs etmək mümkündür.Yüngül sənaye pambıqtəmizləmə, xalçaçılıq sahələri ilə təmsil olunur. Xüsusilə, qida sənayesi üzrə ixtisaslaşan müəssisələrində şərab və ət, həmçinin, süd məhsulları hazırlanır. Burada iqtisadi potensialın yüksək olması, həm də, tut bağlarının çox olması ilə ifadə oluna bilər ki, nəticədə də, baramaçılıq perspektivliliyi üçün zəmin yaranmışdır. Qeyd olunanlardan da aydın olur ki, Qarabağda, xammal mənbələrinin əlçatanlığı, emal proseslərinin və fasiləsiz istehsalın təminatlılığına səbəb olmuşdur.

## Qarabağ iqtisadi rayonunun inkişafı və uzunmüddətli perspektivlər

Qarabağ və işğaldan azad olunan digər ərazilərimiz milli iqtisadiyyatımız üçün böyük perspektivlər vəd etməkdədir. Yeni iqtisadi inkişaf mərhələsinin əsaslarını məhz bu amilin də payı şaxəlidir. Yeni reallıqlar əsasında milli iqtisadiyyatın uzunmüddətli perspektivlərinin həyata keçirilməsində Qarabağın abadlaşması mühüm təsirə malik olacaqdır. Bu məqsədlə, Azərbaycan dövləti tərəfindən sistemli tənzimləmə siyasəti reallaşmaqdadır. Dövlət başçısının Azərbaycan Respublikasının işğaldan azad olunmuş ərazilərində müvəqqəti xüsusi idarəetmənin təşkili haqqında 29 oktyabr 2020-ci il tarixli Fərmanı ilə müvafiq dövlət orqanlarının nümayəndələrinin daxil olduğu əməliyyat qərargahları yaradılmışdır. Həmin qurumlar vasitəsilə işğaldan azad olunan ərazilərdə bütün sahələr, o cümlədən, iqtisadi təhlükəsizlik, sabitlik və fəaliyyət üzrə məqsədyönlü tədbirlərin həyata keçirilməsi nəzərdə tutulmuşdur. Qeyd etmək olar ki, bu sahədə, müvəqqəti komendatlığın Azərbaycan Respublikasının İqtisadiyyat Nazirliyi ilə birgə fəaliyyəti əsasında infrastruktur obyektlərinin, torpaq sahələrinin və digər daşınmaz əmlak obyektlərinin ilkin inventarlaşdırılması və mühafizəsi müəyyən olunmuşdur. Eyni zamanda, həmin qurumun Kənd Təsərrüfatı Nazirliyi ilə birlikdə kənd təsərrüfatı üçün yararlı torpaqların müəyyən olunması, kənd təsərrüfatı texnikası və istehsal vasitələrinin, kənd təsərrüfatı heyvanlarının uçotunun aparılması, saxlanılması və mühafizəsi, fitosanitar və epizootik vəziyyətin ilkin qiymətləndirilməsi nəzərdə tutulmuşdur (5).

Bunlarla yanaşı, Qarabağ iqtisadi rayonunda bir çox iqtisadi və sosial istiqmətli proseslərin təmin olunması, həmçinin:

–təbii və iqtisadi resurslarından milli iqtisadiyyatımızın prioritetləri üzrə düzgün istifadə olunması;

–əmək ehtiyatlarının qiymətləndirilməsi və onlardan səmərəli istifadə olunmanın yollarının tapılması;

–yeni təsərrüfatçılıq fəaliyyətinin, xüsusilə də, fasiləsiz istehsal prosesinin və etibarlı məşğulluq siyasətinin təşkili;

–iqtisadiyyatın sahə strukturunun əlaqəli inkişafı üçün zəmin yaratmaq və bu sahədəki idarəetmənin təşkili məsələlərinin diqqətdə saxlanılması;

–zəruri infrastruktur təminatının və investisiya layihələrinin reallaşmasının təmin olunması və s.

məqsədilə, tədbirlər davam etdirilməkdədir. Təbii olaraq, bütün bunlar üçün ümumilikdə, işğaldan azad olunan ərazilərin iqtisadi perspektivləri də mövcuddur. Belə ki, təkcə, kənd təsərrüfatına aid olan bir məqamı qeyd etmək kifayət edir ki, ölkəmizin 8,64 milyon hektar təşkil edən ümumi ərazisinin 55 faizi və ya 4,74 milyon hektarı kənd təsərrüfatı təyinatlı torpaqlardan ibarət olmaqdadır. Belə ərazilərin təqribən 1,8 milyon hektarı əkin torpaqları olmuşdur ki, onun da, 181,6 min hektarı işğal altında olmuşdur (6).

Qarabağ iqtisadi rayonunda bu layihələrin uğurlu icra olunması, ümumilikdə, makroiqtisadi inkişafın ifadəsinə çevrilmiş olan etibarlı investisiya mühitinin mövcud olmasının göstəricisidir. Təbii olaraq, bu anlayış isə kapitalın tətbiq olunduğu ölkədəki mövcud şərait nəzərdə tutulur. Bu şəraitə siyasi, iqtisadi, maliyyə, sosial, təşkilati-inzibati və s. amillər təsir edir (Məmmədli, İsmayılov, 2006: 36).

## Qarabağ iqtisadi rayonunun bərpası ölkənin sənayeləşmə siyasətinin məhsuldarlıq amili olaraq

İşğaldan azad olunan ərazilərin abadlaşdırılması, modern iqtisadi inkişaf mərhələsinin başladılması və milli iqtisadiyyatın uzunmüddətli perspektivlərinin əlçatan olması ölkənin iqtisadi siyasətinin zəruri tərkib hissəsi olub, mərhələ-mərhələ reallaşmaqdadır. Bu məqsədlə, dövlət başçısının 2 fevral 2021-ci il tarixli Sərəncamı ilə təsdiq olunmuş Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlərin mühüm əhəmiyyətini qeyd etmək olar. Orada 44 günlük Vətən savaşından Zəfərlə çıxmaqla, işğaldan azad olunmuş ərazilərin ölkənin ümumi iqtisadiyyatına reinteqrasiyası nəzərdə tutulmuş, növbəti onillikdə ölkənin sosial-iqtisadi inkişafına dair reallaşdırılması hədəflənən beş Milli Prioritetdən biri olaraq, işğaldan azad olunmuş ərazilərə böyük qayıdışın başladılması diqqətdə saxlanılmışdır. Möhkəm təməl üzərində qurulan yaşayışı təmin etməklə bölgənin ölkə üzrə iqtisadi fəaliyyətdə payını işğaldan öncəki vəziyyətə çatdıra və onu davamlı artıra bilərik. Bu prosesdə zəruri stimullara əsaslanan özəl təşəbbüslərin hərtərəfli təşviqi, eləcə də dövlət-özəl tərəfdaşlığının inkişafı vacibdir (8).

Azərbaycan dövləti milli iqtisadiyyatın davam edən islahatları əsasında işğaldan azad olunan ərazilərdə yeni təşkilatlanmaları və strukturlaşma işlərini qətiyyətlə başlatmış və uğurla davam etdirməkdədir. Bu, əsas etibarı ilə cəmiyyət üzvlərinin sosial mənafeyini, iqtisadi maraqlarını dolğun əsaslarla ifadə edir və onun davamlılığına təminat yaratmaqdadır. Milli iqtisadiyyatın aktuallığını qoruyan və artırmış olan reallıqlarından biri olaraq, sənayeləşmə siyasətinin davamlılığı 2011-ci ildən etibarən Sənaye Park və Məhəllələrinin yaradılması ilə daha da etibarlılıq qazanmışdır. Artıq ölkəmizdə yeddi Sənaye Parkı və beş Sənaye Məhəlləsi yaradılmışdır. Bu proseslər, ərazilərin ixtisaslaşmasına və əmək ehtiyatlarından istifadə olunma meyarlarına əsasən aparılmaqla,işğaldan azad olunan ərazilərdə də nəzərdə tutulmuşdur.

Təbii olaraq, bu sahədə olduqca mühüm amillərdən biri də Qarabağ iqtisadi rayonuna daxil olan ərazilərdə belə bir iqtisadi qurumun yaradılması ilə ifadə oluna bilər. Məhz dövlət başçısının 28 may 2021-ci il tarixində imzalamış olduğu Fərmanla Ağdam Sənaye Parkı yaradılmışdır. Fərmanla müəyyən olunur ki, Ağdam Sənaye Parkı sahibkarlıq fəaliyyətinin həyata keçirilməsi üçün zəruri infrastrukturu və idarəetmə qurumları olan, müasir texnologiyaların tətbiqi yolu ilə sənaye sahəsində rəqabətqabiliyyətli məhsul istehsalı, emalı (təkrar emalı) və satışı, habelə xidmətlər göstərilməsi üçün istifadə olunan, sahibkarların səmərəli fəaliyyətinə və inkişafına kömək edən ərazidir (9).

Qarabağ iqtisadi rayonunda reallaşan bu təminatlar etibarlı iqtisadi infrastruktur quruculuğu prosesləri ilə daha mütərəqqi görünməkdədir. Bu, eyni zamanda, qarşıdakı dövrlərdə iqtisadi rayonda insanların normal həyat fəaliyyətinin təmin olunmasında bir başa və dolayısı ilə iştirak edən, milli iqtisadiyyatın ayrılmaz tərkib hissəsi olan sahələr dəsti olmaqla, adamların sosial vəziyyətinin yaxşılaşdırılmasına xidmət göstərən sahələrin məcmusundan ibarət olan sosial infrastruktur (Məmmədov, 2017: 52) təminatından ibarət olmaqdadır.

Qeyd etmək olar ki, bu əsaslandırma Sənaye Parkları haqqında Nümunəvi Əsasnamədə ümumilikdə, Sənaye Parklarının fəaliyyətinin davamlılığına və fəaliyyətinin səmərəli təşkilinə işıq salınaraq, eyni zamanda, müvafiq ərazi üzrə Sənaye Parkının xarakterik xüsusiyyətləri nəzərə alınmaqla müəyyən olunmuşdur (Qasımov, 2020: 104). Məhz bu mənada, qeyd etmək olar ki, Ağdam Sənaye Parkı da bütün tərəfləri ilə, ölkəmizin sənayeləşmə siyasətinin hərəkətverici qüvvəsi olacaq və onun etibarlılığını daha da gücləndirəcək. Göründürü kimi, Ağdam Sənaye Parkı 190 hektarlıq sahəsi ilə malik olduğu iqtisadi idarəetmə xüsusiyytlərinə görə həm də, innovativ inkişafa istiqamətlənən, emal prosesinə və davamlı məhsul istehsalına əsaslanan, xidmət sektorunun inkişafına zəmin yaratmış olan, yaradıcı ideya və təşəbbüslərə yola açan iqtisadi və sosial

mahiyyətli qurumdur. Təbii olaraq, ən mühüm mərhələlərdən biri işğaldan azad olunan ərazi olaraq, Ağdam Sənaye parkının da yerləşmiş olduğu ərazinin təhlükəsizliyinin təmin olunmasından ibarətdir. Bu mənada, qeyd etmək olar ki, hal hazırda işğaldan azad olunan digər ərazilərimiz kimi bu Sənaye Parkının da ərazisinin minalardan tam olaraq təmizlənməsinin mühüm əhəmiyyətini qeyd etmək olar. Parkın ərazisində yeddi sahibkarlıq sübyektinə rezidentlik statusu da verilmişdir.

"Prof-Dam" MMC 2 ha ərazidə müxtəlif növ dam örtüklərinin istehsalı müəssisəsi inşa edəcək, "Metkons" MMC isə havalandırma, yanğınsöndürmə avadanlıqları və müxtəlif metal məmulataların istehsalı ilə məşğul olacaq. Qeyd etmək olar ki, layihələrin ümumi dəyəri 9 milyon manata yaxındır və onların reallaşması ilə 85 nəfərin işlə təmin olunması mümkün olacaq (12).

Burada onu da qeyd etmək yerinə düşər ki, ümumilikdə, işğaldan azad olunan ərazilərdə bu cür təsisatların yaradılması davamlı xarakterə malik olmaqdadır. Qarabağ iqtisadi rayonunda Ağdam Sənaye Parkının yaradılması ilə yanaşı, dövət başçısının 4 oktyabr 2021-ci il tarixində imzalamış olduğu Fərmanla Araz Vadisi İqtisadi Rayonu Sənaye Parkı yaradılmışdır. Bütün bunların nəticəsində aydın olur ki, işğaldan azad olunan ərazilərdə sistemli idarəetməyə, dayanıqlı təşkilatlanmaya və fasiləsiz istehsala istiqamətlənən tədbirlər dinamik olaraq davam etdirilməkdədir.

Təbii olaraq, bütün bunlar, həm də, ümumilikdə, müəyyən xalqa, millətə məxsus olub, onun mənafelərini ifadə edən, hüdudları dövlət sərhədləri ilə məhdudlaşan, özünün maddi-texniki əsası, münasibətlər sistemi, təsərrüfat mexanizmi və idarəetmə strukturları olan sosial-iqtisadi orqanizm olan milli iqtisadiyyatın əsas mahiyyəti baxımından aktualdır (İbadov, 2009: 338).

## Qarabağ bölgəsinin iqtisadi inkişafı səmərəli məskunlaşma siyasətinin hərəkətverici qüvvəsidir

İnkişafın hazırkı mərhələsində Qarabağda həyata keçirilmiş olan tədbirlər ölkənin məcmu makroiqtisadi hədəflərinin gerçək ifadəsini təşkil etməkdədir. Qarabağ iqtisadi rayonunun 905 min nəfər əhalisi vardır. Milli Piroitetlərin əsas hədəflərindən biri olaraq, regionun iqtisadi potensialından səmərəli istifadə olunmaqla, əhalinin məskunlaşma səviyyəsinin işğaldan əvvəlki səviyyəyə çatdırılması təmin olunmalıdır. Təbii olaraq, qeyd olunan tənzimləmə mexanizmlərinin həyata keçirilməsində çox zəruri məqsədlərdən biri də, səmərəli məskunlaşma proseslərinin həyata keçirilməsindən ibarət olmaqdadır. Qarabağ iqtisadi rayonunun abadlaşması və yenidən bərpa olunması, buradakı əhalinin məskunlaşması, fəaliyyətini, məşğulluğunu, sosial rifahını, bütün bunlarla isə, ölkənin makroiqtisadi inkişafında fəal iştirakçı olmasını təmin edəcək. İqtisadi rayonun əhalisi, həmin iqtisadi rayona daxil olan inzibati rayonlar üzrə aşağıdakı kimi olmuşdur:




**Şəkil 1. Qarabağ iqtisadi rayonunda əhalinin artım vəziyyəti (min nəfər)**

Qeyd etmək olar ki, Qarabağ münaqişəsi zamanı məcburi qaçqın və köçkün olan bacı və qardaşlarımız ölkəmizin ümumilikdə, 62 şəhər və rayonunda məskunlaşmışdır. Məhz Qarabağ iqtisadi rayonunun da əhalisi ölkəmizin digər şəhər və rayonlarında məskunlaşsa da, ümumi əhali sayının qeydə alınması baxımından Azərbaycan Resbuplikasının Dövlət Statistika Komitəsinin məlumatları əsasında tərtib etdiyimiz şəkil 1-in məlumatlarında olduğu kimi qərarlaşmışdır. Hər iki il üzrə müqayisəli təhlillər apararkən aydın olur ki, 2009-2021-ci illərdə əhalinin sayı aşağıdakı kimi təşəkkül tapmışdır:




**Şəkil 2. Qarabağ iqtisadi rayonuna əhalinin artım vəziyyəti (2009-2021-ci illər, dəfə)**

Bu illər ərzində Qarabağ iqtisadi rayonunda iqtisadi göstəricilərin təhlilini apararkən, inzibati rayonların ərazisi və orada əhalinin sıxlığı haqqında məlumatlar da diqqətimizi çəkir. Bu barədə məlumatları aşağıdakı kimi təqdim etmək olar:

**Cədvəl 1.**
**Qarabağ iqtisadi rayonu üzrə inzibati rayonların ərazisinə və əhalinin sıxlığına dair məlumatlar**

| S/s | İnzibati şəhər və rayonlar | Ərazi, minkv. km1) | 01.01.2021-ci il tarixəəhalinin sıxlığı (1 kv. km, nəfər) |
|---|---|---|---|
| 1 | Xankəndi şəhəri | 0,008 | 6988 |
| 2 | Ağcabədi rayonu | 1,76 | 78 |
| 3 | Ağdam rayonu | 1,15 | 178 |
| 4 | Bərdə rayonu | 0,95 | 167 |
| 5 | Xocalı rayonu | 1,00 | 29 |
| 6 | Xocavənd rayonu | 1,46 | 30 |
| 7 | Füzuli | 1,39 | 97 |
| 8 | Şuşa rayonu | 0,31 | 113 |
| 9 | Tərtər rayonu | 0,96 | 109 |

Qeyd olunan amillər özünün yüksək elmi və təcrübi mahiyyəti ilə Azərbaycan dövlətinin güclü iqtisadi müstəqilliyinin çox zəruri göstəricilərini ifadə etməkdədir. İqtisadi müstəqillik anlayışında:

1. Xalqın tarix boyunca yaratdığı və təbiətin ona bəxş etdiyi sərvətin sahibi olması;
2. Cəmiyyət özünü iqtisadi cəhətdən yaşatmaq gücünə malik olur, əsasən, özünün imkanlarına vətarixi reallıqlara arxalanmaqla, iqtisadiyyatın ictimai formasını müəyyən etməsi və formalaşdırması;
3. Tərəddüd etmədən xarici iqtisadi əlaqələr yaratmaq, sərbəst dünya bazarına çıxa bilmək, xarici rəqabətə qarşı davamlı olmaq, bir sözlə, iqtisadi müstəqilliyə malik olması yer almaqdadır (Alıyev, İbadov, 1999: 14).

## Nəticə

Beləliklə, Qarabağ iqtisadi rayonunun bərpası və yenidən qurulması ilə bağlı olan məqsədyönlü tədbirlərin davamlılığı göstərir ki:

– Artıq tam təhlükəsiz, etibarlı və dayanıqlı iqtisadi fəaliyyət mühitinin yaradılması üçün müvafiq təsisatlar yaradılmışdır. İlkin mərhələdə ərazilərin minalardan təmizlənməsi sonrakı ardıcıl tədbirlər üçün münbit zəmin üçün əsas olmaqdadır;

– İqtisadi rayonun əhatə etdiyi inzibati rayonların iqtisadi, coğrafi və təbii potensialı araşdırılaraq milli iqtisadiyyat üçün səmərəlilik göstəriciləri dəyərləndirilməkdədir. Bu isə, öz növbəsində, bütövlükdə, iqtisadiyyatın sahə strukturu üçün əlverişlilik gətirəcəkdir;

– İqtisadi rayon ərazisində maddi-mədəniyyət nümunələrinin bərpası əsasında və digər önəmli təminatlar müstəvisində mövcud olan çoxşaxəli turizm resurslarının ortaya çıxarılması və ondan milli iqtisadi inkişaf üçün faydalanmaq mümkün olacaq. Bu, xüsusilə də, ixtisaslaşdırılmış turizm sənayesinin yeni perspektivləri üçün də olduqca əhəmiyyətlilik qazandıracaq. Təbii olaraq, bu isə, sosial dayanıqlılıq baxımından aktuallığını artırmış olacaq;

– Ərazinin tam abadlaşması nəticəsində ölkəmizin ərazisinin əsas hissəsi ilə ayrılmaz tərkib hissəsi olan Naxçıvan Muxtar Respublikasının tam əlaqələndirilməsi mümkün olacaq ki, bununla da, bütün ərazilər üzrə əmtəə dövriyyəsinin də davamlılığına daha da güclü təminatlar yaranmış olacaq;

– Yaxın gələcək üçün təşkilatlanma işlərinin qətiyyətlə davam etdirilməsi Azərbaycan dövlətinin yeni iqtisadi inkişaf mərhələsində daha böyük uğurlarının ifadəsi olacaqdır. Makroiqtisadi inkişafın bundan sonrakı təşəkkülü proseslərində ümumilikdə, işğaldan azad olunan ərazilərin çəkisi artmaqla, regional iqtisadi inkişaf üçün daha səmərəli potensial formalaşacaq. Bu isə, təbii olaraq, ölkənin uzunmüddətli iqtisadi prioritetlərinin gerçək ifadəsinə çevrilməkdədir.

## Ədəbiyyat


1. https://mod.gov.az/az/qarabagin-tarixi-075/
2. https://president.az/az/articles/view/52389
3. Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı (2004-2008-ci illər). (2007). Tam mətnli elektron materiallar məcmuəsi. Bakı.
4. Allahverdiyev, N. (1991). Azərbaycan SSR iqtisadi və sosial coğrafiyası. Bakı: Maarif.
5. https://www.e-qanun.az/framework/34254
6. https://president.az/az/articles/view/51773
7. Məmmədli, O., İsmayılov, F. (2006). Bazar iqtisadiyyatının dövlət tənzimlənməsi. Bakı: MBM.
8. https://fed.az/az/senaye/daha-2-sirket-agdam-senaye-parkinin-rezidenti-oldu-130452
9. https://e-qanun.az/framework/46229
10. Məmmədov, H. (2017). Davamlı iqtisadi inkişaf: infrastruktur problemləri. Naxçıvan: Əcəmi.
11. Qasımov, C. (2020). Naxçıvan Muxtar Respublikasının sosial-iqtisadi inkişafı regional dövlət proqramlarının icrası müstəvisində (2004-2008-ci illər). Naxçıvan: Əcəmi.
12. https://president.az/az/articles/view/50474
13. İbadov, S. (2009). İqtisadi nəzəriyyə. Dərslik. Bakı: Şərq-Qərb.
14. Alıyev, İ., İbadov, S. (1999). Azərbaycan iqtisadiyyati. Bakı: Ağrıdağ.


Göndərildi: 25.06.2022 Qəbul edildi: 12.08.2022

DOI: https://doi.org/10.36719/2706-6185/14/13-19

**Afaq Bəxtiyar qızı Nəsibova**
Bakı Slavyan Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru
afaqnesibova@mail.ru

# XIX ƏSRİN SONU XX ƏSRİN ƏVVƏLLƏRİNDƏ AZƏRBAYCANDA PEŞƏ TƏHSİLİNİN İNKİŞAFI TARİXİNDƏN

**Xülasə**

XIX əsrdən başlayaraq çarizmin işğalçılıq siyasəti uzun illər Azərbaycan xalqının maarif və mədəniyyətinin inkişafına maneəçilik törətmişdi. Lakin bununla belə XIX əsrin sonlarından etibarən Azərbaycanda istər sənaye və təsərrüfat sahələri, istərsə də mədəniyyət və maarif sahələrində də canlanma müşahidə olunmaqda idi. Çox təəssüf hissi ilə qeyd etməliyik ki, iqtisadi, siyasi və mədəni inkişafa baxmayaraq, XX əsrin əvvəllərində hələ də əhalinin əksər hissəsi savadsız idi. İbtidai savadı və peşə bilgisi olmayan əhali öz haqq və hüququnu da müdafiə edə bilmirdi. Eyni işi gördükləri halda xaricdən gələn işçilər yerli işçilərdən daha çox əmək haqqı alırdı. Buna səbəb kimi çarizmin qeyri-rus xalqlarının, o cümlədən Azərbaycan xalqının savadlanmasını özü üçün böyük bir təhlükə hesab etməsi ilə əlaqədər, müxtəlif bəhanələr gətirərək hər addımbaşı milli ucqarlarda elm və savadın yayılmasına maneə törətməsi olmuşdur. Çünki sadə xalqın elm və savada yiyələnməsi onun azadlığı yolunda atılmış ən böyük addım olardı.

***Açar sözlər:*** *maarif, savad, peşə təhsili, fəhlələr, sənaye*

**Afag Bakhtiyar Nasibova**
Baku Slavic University
doctor of philosophy in pedagogy
afaqnesibova@mail.ru

# From the history of the development of professional education in Azerbaijan at the end of the XIX – beginning of the XX century

**Abstract**

Starting from the 19th century, the occupation policy of tsarism hindered the development of education and culture of the Azerbaijani people for many years. However, since the end of the 19th century, there has been a revival in Azerbaijan both in the sphere of industry and economy, and in the sphere of culture and education. We note with regret that, despite economic, political and cultural development, at the beginning of the 20th century, the majority of the population was still illiterate. The population without primary education and professional knowledge could not defend their rights. Foreign workers were paid more than local workers for the same work. The reason for this was that tsarism considered the education of non-Russian peoples, including the people of Azerbaijan, a great threat to itself, and at every step prevented the spread of science and literacy in the national hinterlands, giving various excuses. Because the acquisition of science and knowledge by ordinary people would be the biggest step towards their freedom.

***Keywords:*** *enlightenment, literacy, professional education, workers, industry*

## Giriş

XIX əsrin sonu, XX əsrin əvvəllərindən başlayaraq Azərbaycanda məktəb və peşə təhsilin sürətli inkişafı nəzərə çarpmaqda idi. Yeni təhsil ocaqlarının açılması, orada təhsil alanların sayının artması Azərbaycanın iqtisadi, ictimai-siyasi inkişafı ilə bir başa əlaqədar idi. Çünki həmin dövürdə neft sənayesinin, gəmiçilik və ticarətin inkişafı ilə Bakı bir anda böyük sənaye şəhərinə çevrilmişdi. Azərbaycanda neft sənayesi ilə bərabər, qeyri-neft sənayesi – ayaqqabı, paltar, ipək və pambıq parçalar, mahud, keçə, kəndir, dülgərlik, xarratlıq, xamıtçılıq, dulusçuluq və başqa sahələrin də

inkişafı burada çalışan ixtisaslı kadrlara böyük ehtiyac yaratmışdı. Məhz bu tələbat peşə məktəblərinin açılmasına təkan vermişdi.

Qeyd etmək lazımdır ki, yüngül sənaye sahələri təkcə paytaxt Bakıda deyil, eyni zamanda Gəncə, Şəki, Şuşa və digər şəhərlərdə də inkişaf etməyə başlamışdı. Məhz bütün bunların əsasında savadlı, istedadlı, rus dilini bilən, müasir texnikadan və cihazlardan istifadə etməyi bacaran insanlara böyük ehtiyac vardı. Bu ehtiyacın aradan qaldırılması daha çox yaşlı, artıq müəyyən bir sahədə çalışan, lakin hələdə ibtidai və texniki savada malik olmayan insanlar təhsili ilə həyata keçirilirdi. Çünki ucuz işçi qüvvəsi ilə işləməyə alışan sahibkarlar özləri də zamanın tələbləri ilə ayaqlaşaraq, ümumi və texniki- peşə təhsilinin verilməsi məqsədilə yaşlılar üçün müxtəlif məktəb və kursların açılmasının marağında idilər. Artıq XIX əsrin 70-80-ci illərindən etibarən Azərbaycanda dövrün tələblərinə uyğun olaraq bu məqsədə xidmət edən peşə təhsil müəssisələri ard-arda açılmağa başladı.

Artıq 1829-cu ildə Şəki Xanabadda ipək sarıma manifakturası açılmışdı. Burada ipək yeni üsulla – dəzgəhları hərəkətə gətirən buxarla istehsal olunurdu. Sənayedə yeni dəzgahlardan istifadə ixtisaslı kadrları tələb edirdi. Bu tələbatı ödəmək məqsədilə 1843-cü ildə Şəkidə "təcrübə ipəkçilik məktəbi" adı altında məktəb fəaliyyətə başladı. Bu məktəbdə təhsil alanlara xarratlıq peşəsinin də incəlikləri öyrədilirdi. Məktəb fəaliyyət göstərdiyi 20 il (1843-1864) müddətində orda 236 nəfər təhsil alsa da, cəmi 117 nəfər oradan məzun ola bilmişdi. Burada 16-18 yaşlı gənclər təhsil alırdı. İpəkçilik məktəbinin təhsil müddəti 4 il idi. "Azərbaycan tarixi" kitabında məktəbin o dövr üçün əhəmiyyəti vurğulanaraq qeyd olunmuşdu: "Bu məktəb təkcə Azərbaycanda deyil, eyni zamanda, bütün Zaqafqaziyada ipəkçiliyin inkişafı üçün mühüm əhəmiyyətə malik idi" (İsmayılov, 2008: 70).

Sonralar buxar maşınlarını istəfadə etməklə ipək sarıma Ordubadda da tətbiq olunmağa başlandı. Yeni metodların tətbiqi ilə istehsal olunan xalça və ipək məhsulları təkcə Azərbaycanda deyil, onun hüdudlarından kənarda da müxtəlif sərgilərdə yüksək qiymətləndirilmiş, uğurlar qazanmışdılar.

Ümumilikdə, 1843-cü ildə Xəzəryanı ərazilərdə 8000-dən çox sənətkar və xeyli usta var idi. Bundan başqa Nuxada xalçaçılıq, ağac üzərində naxış, ipək sarıma, Lahıcda mis qabların istehsalı, dəmirçilik kimi sahələr inkişaf etmiş, qəza və şəhər məktəblərində sənət, kənd təsərrüfatı, bağçılıq və s. bilikləri öyrədən əlavə fənlər tədris olunmuşdu. Lakin bu biliklərin verilməsi təcrübəsi gözlənilən nəticə əldə olunmadığı üçün effektiv sayılmamışdı. Bundan sonra yeni sənət öyrədən və kənd təsərrüfatı məktəbləri açılmağa başlandı.

Mövcud şəraitdə fəaliyyət göstərən peşə məktəbləri əhalinin artmaqda olan peşə təhsilinə olan tələbatını ödəməkdə çətinlik çəkirdi. Bu məqsədlə Bakı ibtidai məktəbinin nəzdində 1874-cü ildə şəhər vəsaiti ilə idarə olunan, dülgərlik və xarratlığın öyrədildiyi peşə təhsili şöbəsi təsis edildi. 1888-ci ilə kimi fəaliyyət göstərən və sonralar müstəqil sənət məktəbinə çevrilən şöbədə keçirilən dərslər sırf təcrübi xarakterli idi. Bu sənət məktəbinin əsas məqsədi bir tərəfdən valideyn himayəsindən məhrum uşaqları pis vərdişlərdən uzaq tutmaq, onların asudə vaxtlarını düzgün təşkil edə bilmək idisə, digər tərəfdən bu uşaqlara gələcəkdə Bakı və onun ətraf rayonlarında, neft mədənlərində, fabrik və zavodlarda II dərəcəli texnik və ya digər sənətlərdə işləyərək öz dolanışıqlarını təmin etmək imkanını vermək idi. Belə gözəl məqsədlərə xidmət edən məktəbin şagirdlərinin sayı ildən-ilə artırdı. Müqayisə üçün deyə bilərik ki, əgər 1892-ci ildə peşə məktəbinin şagirdlərinin sayı 69 nəfər idisə, 1893-cü ildə onların sayı 135 nəfərə çatmışdı (ARDTA: 5-7).

1908-ci ildə Şamaxıda yaşlılar üçün mühasibatlıq kursları təsis edilmişdi. Həmin ilin 1 sentyabr tarixindən etibarən adı çəkilən kurslara qəbul elan olunmuş, noyabrın 1-də isə artıq dərslərə başlanılmışdı (ARDTA: 7-9). Lakin bu kurslara əhali tərəfindən marağın və müraciət edənlərin sayının az olması ilə əlaqədar qısa bir müddətdən sonra ora bağlanmışdı.

Azərbaycanın kapitalist istehsalata cəlb olunması ilə Rusiya ilə iqtisadi əlaqələrinin güclənməsi nəticəsində dəniz nəqliyyatına böyük ehtiyac duyulurdu. Xəzər dənizi coğrafi mövqeyinə görə həm daxili, həm də xarici yükdaşımada mühüm strateji əhəmiyyətə malik idi. Bakının Xəzər dənizinin sahilində yerləşməsi, onun liman şəhəri olması və Xəzər dənizi hərbi donanmasının savadlı dənizçilərinin burada cəmləşməsi gəmiçilik sənayesinin məhz paytaxt şəhərində inkişafına gətirib çıxarmışdı. Bura əsasən neft məhsularının Rusiya bazarlarına daşınmasında əsas nəqliyyat yolu idi.

Əlbəttə dənizçiliyin inkişafı bu sahədə çalışan ixtisaslı kadrlara - gəmiçi və mexaniklərə tələbatı artırırdı. Çox təəssüf ki, o dövrdə gəmidə çalışanların əksəriyyəti təhlükəzsiz üzmənin əsas şərtləri

olan losiya (gəmi səfəri ehtiyacları üçün dənizlərin və sahillərin təsviri), metereologiya, naviqasiya cihazlarından istifadə biliklərinə malik deyildilər. Bu məqsədlə gəmi sahibləri lazımi bilik və təcrübəyə malik olan ixtisaslı kadrları ölkədən kənardan Rusiya, Finlandiya, İsveçrə və Almaniya-dan gətirməli olurdular.

Azərbaycanda dənizçilik təhsilinin inkişafı birbaşa peşə təhsilinin inkişafı ilə bağlıdır. Bakıda dənizçilik sinfi ilk dəfə 1881-ci il 8 noyabr tarixində dəniz kənarında yerləşən, “Olgin kazarması” adlanan keçmiş qospitalın binasında fəaliyyətə başlamışdı (Ocherki istorii profesionalno-tekhnicheskogo obrazovaniya v SSSR. 1981: 159). Bina çox darısqal və dərslərin keçirilməsi üçün uyğun deyildi. Zamanla təhsil alanların sayı artdığı üçün də məktəb tez-tez yerləşdiyi ünvanını dəyişdirmək məcburiyyətində qalırdı.

Dənizçilik sinfində tədris ili noyabrın 1-də başlayaraq aprelin 1-nə kimi davam edirdi. Sinfin açılmasında əsas məqsəd Xəzər dənizçiliyinin inkişafına xidmət göstərməklə yerli əhaliyə dənizçi peşəsinin bütün sirrlərini öyrətməkdən və bu yolla da lazımi mütəxəssislər (şturman və şpiker) yetişdirməkdən ibarət idi.

Dənizçilik sinfinin tədris və təlimin təşkili ilə bağlı bütün məsələləri dövrünün təcrübəli dənizçisi, Bakı limanının rəis müavini, Xəzərdəki mayakların rəhbəri, I ranq kapitan N.M.Filipova həvalə olunmuşdu. Elə o özü dənizçilik sinfinin ilk müdiri olmuşdur.

27 iyun 1867-ci il tarixli dənizçilik sinfləri ilə bağlı sərəncama əsasən məktəbə qəbul olmağın əsas şərti rus qramatikasını bilmək idi. Bu səbəbdən də əsas məqsədi azərbaycanlı dənizçilər yetişdirmək olan dənizçilər sinfinə ilk əvvəllər azərbaycanlıların daxil olması qeyri-mümkün idi. Buna görədə nizamnamədə dəyişikliklərin aparılması məsələsi istər rus xadimləri, istərsə də Rusiyanın dövri mətbuatında dəfələrlə mübahisə məsələsinə çevrilmişdi.

Dənizçilik sinfində vahid tədris proqramının olmaması və ora şagirdlərin ilin istənilən vaxtında qəbul olunması müəllimlərin işini çətinləşdirirdi. Sinifdə ümumi və xüsusi fənləri tədris edən müəllimlər işləyirdilər. Ilk illər losiya (gəmi səfəri ehtiyacları üçün dənizlərin və sahillərin təsviri), naviqasiya, astronomiya fənlərini məktəbin müdiri N.M.Filipov, rus dili, riyaziyyat və coğrafiyanı digər şəhər məktəblərinin müəllimləri tədris edirdilər.

Dənizçilik sinfində oxuyanlar yaş, kontingent və hazırlıq səviyyəsinə görə fərqlənirdilər. Əvvəllər burada bir qrupda oxuyanların yaşı 13-30 yaş arasında dəyişirdi. Oxuyanların əksəriyyəti savadsız, ibtidai məktəbdə oxumuş, rus dilini bilməyən, dənizdə heç olmamış təcrübəsiz dənizçilər və təcrübəli losmanlardan ibarət idi.

Dənizçilik sinfində dərslərin ödənişsiz olması, məzunların və qulluqda olanların vergidən və əsgərlikdən azad olması, qısa müddətdə peşəyə yiyələnmək imkanı buraya axının güclü olmasının əsas səbəbi idi. Amma bununla belə, rus dilini lazımi səviyyədə bilməmələri azərbaycanlılara bura qəbul olmaqda böyük maneə törədirdi. Lakin nizamnamədə qeyd olunduğu kimi, qəbul olunanların mütləq “rus dilini bilmə” tələbinə baxmayaraq məktəb müəllimləri azərbaycanlı şagirdlərə güzəştə gedərək azsavadlıları da dənizçilik sinfinə qəbul edir, onlara rus dilinin qrammatikasını, rus dilində yazıb- oxumanı öyrədirdilər. Bu da sonralar dənizçilik sinfində təhsil alanlar sırasında azərbaycanlıların sayının artmasına gətirib çıxarmışdı.

Bakı dənizçilik sinfinin zamanla şöhrət qazanması bura başqa ölkələrdən olan gənclərin də axınına səbəb olmuşdu. Təhsil almaq üçün Bakıya Həştərxan, Tiflis, Stavropol, Tambov və başqa ərazilərdən də gəlirdilər. Dənizçilik sinfinin uğuru onun məzunlarının sayında da özünü göstərirdi. Əgər 1889-cu ildə buraxılış imtahanını uğurla verib diplom alanların sayı 10 idisə, 1894-cü ildə onların sayı artıq 40-a çatmışdı (Tairzade, 2009: 300).

Bakı dənizçilik sinfinin daha bir uğur göstəricisi onun 1889-cu ildə Tiflisdə keçirilən Qafqaz kənd təsərrüfatı və sənaye sərgisində III dərəcəli diploma layiq görülməsi olmuşdur (ARDTA: 1-8).

Ümumilikdə, fəaliyyət göstərdiyi illər ərzində (1881-1902) dənizçilik sinfinin 945 müdavimi sırasında 136 azərbaycanlı olmuşdu.

Sinfi bitirdikdən sonra məzunlar rus dili, riyaziyyat və naviqasiyanı bilməklə yanaşı, xəritəni oxumağı, xəritə üzrə gəminin yolunu müəyyən etməyi, gedilmiş yolu hesablamağı, gəminin coğrafi koordinatlarını müəyyən etməyi bacarmalı və Xəzər dənizinin losiyasını mükəmməl bilməli idilər.

Dənizçilik sinfinin məzunlarını əksər hallarda aşağı səviyyəli vəzifələrə işə götürürdülər. Onlar özləri müstəqil iş axtarır, heç bir təyinat almırdılar. Onların böyük əksəriyyəti isə gəmidə ancaq

qulluqçu vəzifəsində çalışır, çox az bir hissəsi isə xeyirxah kapitanlara rast gəldikləri təqdirdə bu sahədə uğur əldə edə bilirdilər.

Bakı dənizçilik sinfi 1881-1898-ci illərdə birbaşa Xalq Maarif Nazirliyinin nəzarəti altında idi. Sonradan isə tərkibində ayrıca ticarət dənizçiliyi işi üzrə şöbənin fəaliyyət göstərdiyi Maliyyə Nazirliyinə verilmişdi (Tairzade, 2009: 297).

Bakı dənizçilik sinfində ilk struktur dəyişiklik Şəhər duması və qubernatorun bir neçə dəfə müraciətlərindən sonra ticarət donanmasının ehtiyacları əsasında 1891-ci ildə həyata keçirildi. Burada kabotaj buxar gəmiləri üçün komandirlər hazırlayan şkiper şöbəsi fəaliyyətə başladı). Bundan başqa 1896-cı ildə Bakı dənizçilik sinfinin nəzdində gəmi mexaniklərinin hazırlanması məqsədilə iki illik ödənişli axşam kursları da açıldı.

1897-ci ildə dənizçilik sinfinin xahişini nəzərə alan şəhər duması qeyri-rus, xüsusən də azərbaycanlı tələbələrin bəzi fənlərin tədrisi zamanı rastlaşdıqları çətinlikləri aradan qaldırmaq məqsədilə hazırlıq sinfi açdı. 1902-ci ildə isə dənizçilik sinfi Bakı dəniz uzaq səfər məktəbinə çevrildi (ARDTA: 1-8).

Tədris müəssisəsi güclü maddi-texniki bazaya, tədris proqramına əsasən 300 tom xüsusi kitabdan ibarət olan kitabxanaya malik idi. Burada dənizçiliklə bağlı zəngin ədəbiyyat, dövri mətbuat orqanlarının nəşrləri, jurnal və qəzetlər də vardı. Yay aylarında nizamnaməyə əsasən dənizçilik sinfinin sonlarında şagirdlər ticarət gəmilərində təcrübi hazırlıq məqsədilə üzməli idilər. Bu da tədris müəssisəsi rəhbərliyinin təkcə nəzəri bilikləri verməklə kifayətlənmədiyinin, təcrübi biliklərə də necə böyük üstünlük verdiyinin göstəricisi idi.

Bakıda dənizçilik sinfinin, sənət və digər peşə məktəblərinin açılmasından sonra kənd təsərrüfatı məktəbinin də açılması gündəmə gəldi. XIX əsrin 90-cı illərində artıq Zaqatala, Quba və Gəncədə fəaliyyət göstərən peşə məktəblərinin kənd təsərrüfatı şöbələri də vardı.

Dənizçilik məktəbindən başqa XIX əsrin sonlarında Bakıda fəaliyyət göstərən digər bir peşə məktəbi Mərdəkanda açılmış bağçılıq məktəbi olmuşdur.

XIX əsrin sonlarında Bakıda iqtisadi-siyasi vəziyyətin və neft sənayesinin inkişafı ilə əlaqədar bölgələrdən şəhərlərə güclü axın nəticəsində əhalinin sayı artmış, bununla əlaqədar olaraq, təbii ki, kənd təsərrüfatı məhsullarına olan tələbat da yüksəlmişdi. O dövrdə Abşeronda kənd təsərrüfatının ən inkişaf etmiş sahəsi bağçılıq idi.

Abşeron bağları əsasən üzüm, əncir, tut və digər bitki, meyvə və giləmeyvə növləri ilə məşhur idi. Lakin torpağın ilkin formada, kustar üsullarla becərilməsi suvarılmanın zəifliyi, məhsulun zərərli həşəratlardan qorunması üçün lazımi vasitələrin olmaması və digər təbii amillər məhsuldarlığın aşağı olmasına gətirib çıxarırdı. Sadalanan problemlərin aradan qaldırılması yalnız müasir texnologiyalardan istifadə vasitəsilə mümkün ola bilərdi.

Bağçılıq məktəbinin açılması fikrini ilk dəfə 1890-cı ildə Bakı şəhər qubernatoru V.P.Roqqe Mərdəkan kəndində bağda dincələrkən irəli sürmüşdü. İdeya irəli sürülsə də maddi dəstək mənbəyinin olmaması, məktəbin açılmasının maddi yükünün də kəndlilərin üzərinə düşməsi onun açılmasına imkan vermirdi.

Həmişə öz xeyirxahlığı və xalqın maarifləndirilməsi sahəsində xidmətləri ilə tanınan H.Z.Tağıyev bu dəfə də hərəkətə keçərək bağçılıq məktəbinin açılması işini, məktəb binasının tikilməsinin və ilk 10 il onun saxlanılması üçün bütün xərcləri öz üzərinə götürmüşdü.

Əkinçilik və Dövlət Əmlak Nazirliyi bu müddət ərzində illik 2000 rubl borcu da ödəməyi və müddətin sonunda məktəbi öz mülkünə çevirməyi qərarlaşdırmışdı. Mərdəkan kənd cəmiyyəti də öz növbəsində məktəb binasının tikintisi üçün 10 desyatin torpaq ayırmışdı.

Məktəb binasının tikinti işləri 1896-cı ilin aprel ayında tamamlandı. Məktəb korpusu iki böyük sinif otağından ibarət idi. Hər bir sinif 40 nəfər şagirdin oxuması üçün nəzərdə tutulmuşdu. Məktəb binasında həmçinin müəllimlər və tədris vəsaitləri üçün kabinet, kitabxana və geniş veranda vardı.Əgər ehtiyac olarsa burada üçüncü sinfin açılması da mümkün idi. Tədris prosesində müəllimlərin yerləşdirilməsi üçün 3 otaqlı evlər yaradılmışdı. Burada gələcəkdə şagirdlər üçün yataqxananın da tikilməsi nəzərdə tutulmuşdu. Bina memari gözəlliyi və dəbdəbəliliyi ilə seçilirdi. Torpaq dərindən işlənilmiş, hətta başqa yerlərdən məhsuldar torpaq belə gətirilmişdi. Abşeronda suvarma problemi olduğu üçün xüsusi suvarma sistemi yaradılmışdı.

Bağçılıq məktəbinin yaradılmasına H.Z.Tağıyev xüsusi qayğı ilə yanaşırdı. Məktəbin bağında

müxtəlif növ bitkilər, meyvə ağacları, dekorativ bitkilər, güllər, kollar və s. əkilmişdi. Azərbaycanda ilk dəfə olaraq şitillik burada salınmışdı. Bağın gözəl tərtibatı və dekorativ bitkilərin əkilməsi üçün Tağyev özü şəxsən tanınmış bağban Kinseli dəvət etmişdi.

Məktəbdə tədris prosesi 3 il davam edirdi. Onun nəzdində həmçinin 2 illik hazırlıq sinfi də fəaliyyət göstərirdi. Məktəbin nizamnaməsində burada yaşı 13-dən yuxarı olan gənclərin oxuması nəzərdə tutulsa da, sonralar məktəbdə yaşlılar da təhsil almağa başlamışdı.

Əkinçilik və Dövlət Əmlak Nazirliyindən məktəbin açılması üçün icazənin alınması bir müddət çəkdi. Əvvəl bir çox mətbuu orqanlarında da qeyd olunduğu kimi məktəbin açılması 13 sentyabr 1896- cı ildə nəzərdə tutulmuşdu. Lakin təmtəraqlı açılış 1896-cı ilin oktyabr ayının 27-də baş tutdu. Buna səbəb kimi bəzi mənbələrdə Tağıyevin səyləri nəticəsində salınmış məktəb bağının payız fəslinin gəlməsi ilə daha füsunkar mənzərə almış gözəlliyini xalqa göstərmək istəyi olmuşdur. Açılış saat 14:00- da baş verdi. Açılışda Bakı quberniyasının qubernatoru V.P.Roqqe, vitse-qubernator P.A.Liliyev, şəhər baçşısı K.A.İretskiy, klassik kişi gimnaziyasının müdiri Pobedonostsev, real məktəbin direktoru İ.V.Denfer və digər dövlət və quberniya adminstrasiyasının nümayəndələri, orta məktəb müdirləri, din xadimləri, yerli əhali və başqaları iştirak edirdilər (Ibragimov, 1990:109).

Mərdəkan bağçılıq məktəbində birinci il ümumtəhsil fənləri tədris etmək və müvəqqəti olaraq müdir vəzifəsini icra etmək üçün Heydər Muradhasilov, müəllim qismində isə - Hüseyn Xəlilov dəvət olunmuşdu. Onların hər ikisi Zaqafqaziya müəllimlər seminariyasının məzunları və pedaqoji təcrübəyə malik şəxslər idilər. A.Muradhasilov əvvəllər Qızılağac ibtidai məktəbinin, H.Xəlilov isə Quba ikisinifli məktəbinin müəllimi vəzifəsində çalışmışdılar.

Məktəbdə elementar biliklər, hesab və bağçılıq üzrə nəzəri və təcrübi biliklər verilirdi. Dərslər Azərbaycan dilinin köməyi ilə rus dilində aparılırdı. Məktəb fəaliyyətə başladıqdan qısa bir müddət sonra burada yaşlılar üçün axşam kursları və bazar günü oxuları da təşkil edildi. Bu kurslara xalqın marağı böyük idi.

Bazar günü oxuları mütəmadi olaraq əkin işlərindən azad vaxtlarda keçirilir və may ayına kimi davam etdirilirdi.

Birinci tədris ilinin sonunda Mərdəkan bağçılıq məktəbində 43 nəfər, 1898-ci ilin əvvəlində isə 46 nəfər təhsil alırdı. Onların sırasında yaşlılar da çoxluq təşkil edirdilər.

1899-cu ildən başlayaraq isə məktəbdə təhsil alanların sayı azalmağa başladı. Artıq şagirdlərin sayı 30-a enmişdi. Nəhayət, 1900-cu ildə məktəb bağlandı (Teregulova, 1917: 24).

Qısa bir müddət fəaliyyət göstərməsinə baxmayaraq, Mərdəkan bağçılıq məktəbi gözəl şəraiti, düzgün təşkil olunmuş tədris prosesi, verilmiş elementar bilik və bağçılıq sahəsində peşə vərdişlərinə əsasən bu sahədə savadlı, təcrübəli kadrların yetişməsinə təkan vermişdi. Hal-hazırda zamanında H.Z.Tağıyevin böyük səyi və vəsaiti hesabına yaradılmış Mərdakan bağçılıq məktəbinin binasında 123 saylı orta məktəb yerləşir. Məktəbin geniş həyətində Tağıyevin xatirəsinə hörmət əlaməti olaraq onun büstü də ucaldılmışdı.

1901-ci ildə Bakıda qısamüddətli kommersiya kursları da fəaliyyətə başladı. Bu kurslar əsasən yaşlılar üçün nəzərdə tutulmuşdu. Bakı kommersiya kurs və məktəblərinin əsas məqsədi dövrün tələblərinə uyğun müəyyən peşələr üzrə çatışmayan mütəxəssislərin hazırlanması idi. Kursların təsis edilməsində başda H.Z.Tağıyev olmaqla, Ş.Əsədullayev, F.Vəzirov, A.Mantaşov, Nobel qardaşları kimi imkanlı şəxslər yaxından iştirak etmişdilər. 1906-cı ilə qədər H.Z.Tağıyev Bakı kommersiya kurs və məktəblərinin ilk fəxri qəyyumu olmuşdur.

Peşə məktəblərinə olan tələbatın artması onların bölgələrdə də açılmasına səbəb olmuşdu. 1882-ci il mayın 15-də Zaqatalada peşə məktəbi açıldı və 1897-ci ildə yenidən təşkil edildi (Əhmədov, 2001: 153).Bu məktəb qəza məktəbinin nəzdində yerli əhalidən yığılan ianələr sayəsində yaradılmış və fəaliyyət göstərmişdi. Məktəbin 20 şagirddən ibarət pansionu da vardı. Hətta əhalinin maddi dəstəyi ilə peşə məktəbi üçün ayrıca tədris məktəbi də tikilmişdi.

Zaqatala peşə məktəbi ilə qəza məktəbi arasında sıx əməkdaşlıq vardı. Belə ki, peşə məktəbinin şagirdləri dülgərlik, çilingərlik, dəmirçilik və başqa sənətləri öyrənməklə barabər, qəza məktəblərində digər tədris fənlərini və rəsm öyrənirdilər. Qəza məktəbinin şagirdləri də həmçinin onlara tədris olunan fənlərlə bərabər, peşə məktəbinin emalatxanasında sənət və kənd təsərrüfatına dair biliklər əldə edirdilər. XIX əsrin 70-ci illərində Gəncədə də peşə məktəbi fəaliyyət göstərirdi. Hələ

1872-ci ildə şəhər sakinləri özləri 3000 rubl ianə toplamış və ayrıca peşə məktəbi açmağa cəhd göstərmişdilər. 1884-cü ilin noyabrın 8-də əhalidən yığılan vəsait hesabına Qafqaz canişini Mixail Nikolayeviçin Qazqazda hökümranlığının 10 illiyi münasibətilə Gəncədə Mixaylovski sənət məktəbi açıldı.

Gəncə peşə məktəbinin əsas məqsədi ibtidai təhsilli bağçılar, əkinçilər, ustalar, dülgərlər, xarratlar və başqa peşə sahiblərini yetişdirməkdən ibarət idi. Məktəb 1 hazırlıq və 4 əsas sinifdən təşkil olunmuşdu. Məktəbdə peşə bilikləri ilə barabər ümumtəhsil bilikləri də verilirdi. 15-20 saat davam edən dərslərdə dəmirçilik, çilingərlik, xarratlıq, dülgərlik və başqa peşələr öyrədilir, 4 ilin sonunda isə şagirdlər özləri istədikləri peşəni seçir və onun incəliklərinə yiyələnirdilər. Buranın məzunları Bakının zavod və fabriklərində, dəmir yolunda işə düzələ bilirdilər. Məktəb 1895-ci ildə yenidən təşkil edilmiş, təhsil müddəti 7 ilə çatdırılmışdı.

1884-1905-ci illər arasında Gəncə Mixaylovski peşə məktəbində təhsil alan 586 şagirddən 110-nu təhsilin başa vura bilmiş, qalan hissəsi ehtiyac və digər səbəblər üzündən təhsillərini yarımçıq qoyaraq işləməyə başlamışdılar.

1895-ci ildən etibarən Gəncə Mixaylovski peşə məktəbinin nəzdində yaşlılar üçün bazar günü kursları açıldı. Burada yaşlılara peşə öyrədilirdi (İsmayılov, 2008: 175).

Akademik Hüseyn Əhmədov "XIX əsr Azərbaycan məktəbi" adlı monoqrafiyasında Azərbaycanda peşə təhsili verən tədris müəssisələrinin açılmasının səbəbini belə izah edir: "Sənət və kənd təsərrüfatı məktəbləri təşkil etmək ideyası, həm də çarizmin məxfi məqsədləri ilə əlaqədar idi. Bu məqsəd az-çox savadı olan gənclərə sənət təmayülü verməklə, bujuaziya üçün əlavə qazanc gətirə biləcək adamlar hazırlamaqdan ibarət idi. Ən əsası isə gənclərin əqli təhsilini məhdudlaşdırmaqdan, meydana gəlməkdə olan proletariatın qarşısını almaqdan ibarət idi" (Əhmədov, 2006: 206). Buradan aydın olur ki, çar Rusiyasının Azərbaycanda peşə, sənət məktəblərinin açılmasındakı "canfəşanlığı" heç də xalqımızın gələcəyini düşünməsindən, peşəkar kadrlar yetişdirmək istəyindən deyil, bu yolla yetişməkdə olan savadlı gənclərin qarşısını almaqdan irəli gəlirdi. Amma bu da danılmaz bir faktdır ki, əksəriyyətində peşə təhsili ilə bərabər ümumtəhsil fənlərin də tədris olunduğu və ibtidai biliklərin verildiyi peşə və sənət məktəblərinin Azərbaycan xalqının, xüsusəndə əhalinin yaşlı təbəqəsinin maarifləndirilməsində mühüm rolu olmuşdur.

Şərqdə ilk dəfə qadınlara seçib-seçilmək hüququnun verildiyi Cümhuriyyət illərində sösüz ki qadınların təhsili də diqqətdən kənarda qala bilməzdi. Bu dövrdə hakimiyyət Azərbaycanda qadınların ümumi, orta, o cümlədən, peşə təhsilinin imkişafına xüsusi qayğı və diqqətlə yanaşırdı. ADR imkansız, ehtiyac içində yaşayan qadınların güzəranını yaxşılaşdırmaq, qayğılarını azltmaq və onlara özünəinam hissini aşılamaq üçün 1917-ci ildə xeyriyyə cəmiyyətləri tərəfindən təsis edilmiş peşə məktəblərinin fəaliyyətini yüksək qiymətləndirir, bu səbəbdən də xüsusi olaraq yaşlı qadınlara peşə öyrətmək məqsədilə tikiş kursları açırdı.

24 mart 1919-cu ildə Azərbaycan milli gimnaziyasının nəzdində qadınlar üçün xüsusi olaraq kursların təmtəraqlı açılışı oldu. Açılışda 120 nəfər qadın iştirak edirdi. Tədbiri öz çıxışı ilə Sara xanım Aşurbəyli açıq elan etdi. Daha sonra Krım tatar qadınları adında Şəfiqə xanım Qaspıralı, Hənifə xanım Məlikova da çıxış etdilər. Onlar öz çıxışlarında kursların açılmasından, qadın təhsilinin önəmindən danışaraq, kursların gələcək fəaliyyətinə böyük ümid bəslədiklərini söyləmişdilər. Adı çəkilən kurslarda dərslər həftədə 3 dəfə olmaqla 3 (savadsızlar, az savadlılar və savadlılar) qrup üzrə həyata keçirilirdi. Burada milli ədəbiyyat, tarix və b. fənlər tədris olunurdu.

## Nəticə

Beləliklə, əminliklə deyə bilərik ki, XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycanda əhalinin müxtəlif peşə sahələri üzrə elmi və texniki biliklərə yiyələnməsində həmin dövrdə fəaliyyət göstərən texniki-peşə məktəblərinin əvəzsiz xidmətləri olmuşdur. Məhz bu məktəbləri bitirən, burada savad və elmi-texniki biliklərə yiyələnən şəxslər gələcəkdə Azərbaycanda neft və qeyri-neft sənaye sahələrinin inkişafı istiqamətində mühüm addımlar atmış, ölkəmizin ən böyük təbii sərvəti olan "qara qızılının", "ağ qızılının", ipəyinin və bir digər sənaye məhsullarının hesabına dünyada tanınmasına səbəb olmuşlar.

## Ədəbiyyat

1. İsmayılov, M. (2008). Azərbaycan tarixi: 7 cilddə. Bakı. 5 s.
2. ARDTA. Fond № 33, siyahı №1, iş № 55
3. ARDTA. Fond № 389, siyahı №6, iş № 27
4. Essays on the history of vocational education in the USSR. (1981). Moscow: Pedagogy.
5. Tairzade, N. (2009). From the history of the Azerbaijani intelligentsia. Baku: Adilloglu.
6. ARDTA. Fond № 389, siyahı №6, iş №245
7. Ibragimov, M. (1990). Entrepreneurial activity of G.Z.Tagiev. Baku: Azerneshr.
8. Teregulova, O. (1917). About kulturno-prosvetitelskoy deyatelnosti sredi musulman. Baku: Kaspiy.
9. Əhmədov, H. (2001). Azərbaycan məktəb və pedaqoji fikir tarixi. Bakı: ABU.
10. Əhmədov, H. (2006). XIX əsr Azərbaycan məktəbi. Bakı: Maarif.

Göndərildi: 29.06.2022 Qəbul edildi: 04.08.2022

DOI: https://doi.org/10.36719/2706-6185/14/20-23

**Şəhla Ayaz qızı Abdullayeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
biologiya üzrə fəlsəfə doktoru
shahla-nasimi@mail.ru

## ABŞERON YARIMADASINDA BİTƏN AĞAC VƏ KOL BİTKİLƏRİ VƏ ONLARIN MİKOBİOTASININ NÖV TƏRKİBİ

**Xülasə**

Təqdim olunan işin əsas məqsədi Abşeron yarımadasının bağlarında istifadə olunan yerli və yad ağacların mikobiotalarının taksonomik tərkibini müəyyən etməkdir. Aparılmış tədqiqatlar nəticəsində ağacların yarpaqlarını yoluxduran göbələklərə aid olan 97 növ patogen mikromiset aşkar edilmişdir. Əvvəlki araşdırmalardan da görünür ki, tədqiqat apardığımız ərazilərdə 15 növ pas göbələkləri aşkar edilib. Onlar 20 növ ağacda bitir. Bunların əksəriyyəti müxtəlif hostlara, yalnız 5-i isə monohost göbələklərə aiddir. Aşkar edilmiş bütün pas göbələkləri geniş coğrafi diapazona malikdir və onlar yalnız ev sahibi bitkilər üçündür. Məlumdur ki, pas göbələklərinin yaranması və inkişaf mərhələsini müəyyən edən amil hava şəraiti, əsasən rütubət, yüksək rütubət və 18-20 dərəcə temperaturdur.

***Açar sözlər:*** *ağaclar, kollar, mikopatokompleks, xəstəliklər, inkişaf dövrü*

**Shahla Ayaz Abdullayeva**
Azerbaijan State Pedagogical University
PhD in biology
shahla-nasimi@mail.ru

## Species composition of trees and shrubs growing on the Absheron peninsula and their mycobiota

**Abstract**

The main purpose of the presented work is to determine the taxonomic composition of the mycobiota of local and foreign trees used in gardens of Absheron Peninsula. As a result of the conducted research, 97 types of pathogenic micromycetes related to fungi infecting the leaves of trees were found. It can be seen from previous studies that 15 types of rust fungi were found in the areas where we conducted research. They are growing on 20 types of trees. Most of these belong to different hosts, and only 5 belong to monohost fungi. All detected rust fungi have a wide geographic range and are restricted to the host plant range. It is known that the determining factor for the occurrence and development stage of rust fungi is weather conditions, mainly humidity, high humidity and temperature of 18-20 degrees.

***Keywords:*** *trees, bushes, mycopathocomplex, diseases, development cycle*

### Giriş

Tədqiqat zamanı aşağıdakı xəstəliklər aşkar edilmişdir.

**Mumiyalama-**xəstəliyin inkişafının son mərhələsidir, bu zaman təsirlənmiş orqanlar adətən təsirlənmiş orqanın nüfuz edən toxumasının miselyumundan və ev sahibi bitkinin çox dəyişmiş toxumalarından ibarət olan sklerotiyaya çevrilir. Ağcaqayın və qızılağac toxumlarında əmələ gələn sklerotiyalar çox kiçik, məsələn, palamut mumiyalaşmasının patogeninin sklerotiyası isə böyükdür. Sklerotiyanın səth təbəqələrinin hüceyrə membranlarının qara rəngi melanin qrupunun piqmentləri ilə bağlıdır. Bu rəngləmə onları ultrabənövşəyi şüaların və digər mənfi ətraf mühit amillərinin zərərli təsirlərindən qoruyur. Bu göbələklərin inkişaf siklində sklerotiyalar göbələklərin qış yuxusuna getdiyi hərəkətsiz mərhələlər rolunu oynayır. Yazda bu göbələklərin meyvə gövdələri çanta sporları daşıyan sklerotiyalardan böyüyür. Ağcaqayın və qızılağac toxumlarının mumiyalanması çiçəklər çanta sporları ilə, palamutlar isə xəstə və sağlam meyvələr təmasda olduqda miselyumla yoluxduqda baş verir. Meyvə mumiyalanması şabalıd, dağ kül və yemişanda da məlumdur (Kobzar, 2006).

**Sitosporoz-**qabığın digər xəstəliklərindən rütubətli havada selikə batırılmış xüsusi sferik spora sahiblərindən (piknidiyalardan) çıxan konidiyalarla fərqlənir. Tez-tez havada donurlar və rənglərinə görə təsirlənmiş orqanların korteksində spiral, tendril və ya damcı şəklində görünürlər. Mucusun rəngi göbələk tərəfindən ifraz olunan piqmentlərdən asılıdır və krem, solğun sarı, narıncı qırmızı, tünd qırmızı və qara rəngdədir. Piknidial göbələklərin seliklərində piqmentlərdən əlavə monosaxaridlər, polisaxaridlər, amin turşuları və su aşkar edilmişdir. Bu göbələklərin həyatında mucusun rolumüxtəlifdir. Piqmentlərin olması səbəbindən konidiyaları günəş işığının zərərli təsirlərindən qoruyur. Monosakkaridlər, polisaxaridlər və amin turşuları konidiyaların cücərməsi üçün qidalandırıcı substrat kimi xidmət edir. Mucus konidiyaların hava axınları ilə yayılmasını asanlaşdırır: kiçik parçalara yapışır, quruyur, hava axınları tərəfindən daha asan götürülür və digər ağaclara köçürülür (Korpaçinski, Vostovskaya, Tomoşeviç, 2011). Yağış damcıları ilə yayıldıqda, mucusun bir çox komponenti tez suda həll olunur və bu məhlul həm də konidiyaların cücərməsi üçün qidalı substrat kimi xidmət edə bilər. Sitosporozla yanaşı, digər növ piknidial göbələklərin törətdiyi digər nekrozlar da məlumdur. Məsələn, dotihitsa törədicisi göbələklərdən biri qovaq gövdələrinin və budaqlarının yerli və ya dairəvi nekrozuna səbəb olur ki, bu da canlı qabıqda əvvəlcə tünd, sonra isə sarımtıl rəngdə fərqlənir. Bəzən xəstə ağaclarda nekrozla yanaşı xərçəng yaraları da görünə bilər. Daha tez-tez onlar miselyumun bir neçə il inkişaf etdiyi qalın gövdələr təsirləndikdəgörünür. Qabıqların ölü və ölməkdə olan nahiyələrində patogenin sporları (piknidiyaları) əmələ gəlir, onlardan qaramtıl-ağ və ya açıq zeytun dəstələri şəklində konidiyalar çıxır. Gövdələrin və budaqlarıntəsirlənmiş sahələrinə boz rəngli bir rəng verirlər (Şipilova, Qavrilova, Qakayeva, 2014).

**Nekroz** kimi xəstəliklər də marsupial göbələklərdən qaynaqlanır. Palıdın klitrus nekrozu məlumdur, bu, sağlam qabıqdan kəskin şəkildə fərqlənən palıd qabığında əvvəlcə qırmızımtıl, sonra sarımtıl-ağımtıl nekrotik nahiyələrin əmələ gəlməsi ilə ifadə olunur. Xəstəliyin törədicisi marsupial göbələk palıd klitusudur. Təsirə məruz qalan toxumada qabıqdakı çatlardan çıxan parlaq çəhrayı və açıq qırmızı yastıqlar aydın şəkildə fərqlənir. Bunlar yarpaqlı və iynəyarpaqlı növlərin nektium nekrozu patogenlərinin sporulyasiyasıdır (Mustafazadə, Məhərrəmova, Qəhrəmanova, Qarayusifova, 2008:35).

Aşağıdakı şəkillərdə xəstəliklər daha aydın görünür: (şəkil 1)



Nekroz



Qonur çürümə

Anatomik və fizioloji dəyişikliklərin birləşməsinə əsasən bitki xəstəliyinin növü müəyyən edilir:

**Saqqız, qatran, selik.** Ən tez-tez yarpaqlı və iynəyarpaqlı ağaclarda müşahidə edilən Erwinia cinsinin bakteriyaları və göbələklər (Ascomycetes) səbəb olur.

**Quru və nəm çürük.** Bitki toxumalarının ayrı-ayrı hissələri bakteriyaların (Pectobacterium cinsi) vəgöbələklərin (Ascomycetes və qeyri-kamil göbələklər) fəaliyyəti səbəbindən yumşalır və məhv olur.

**Tozlu küf.** Yarpaqlarda və tumurcuqlarda ağ örtük görünür ki, bu da göbələklərin (Ascomycetes) çoxalmasının nəticəsidir.

**Saralma, solma, qurutma.** Ən tez-tez göbələklərin (Fungi imperfecti), nadir hallarda bakteriyaların (Corynebacterium cinsi) səbəb olduğu yoluxucu olmayan ola bilər.

**Qaralma**. Göbələklərin, Erwinia cinsinin bakteriyalarının inkişafı səbəbindən yarpaqlarda və tumurcuqlarda qara bir film görünür.

**Yandırmaq.** Yarpaqlar, gənc tumurcuqlar, çiçəklər, meyvələr qəhvəyi olur, qaralır. Yanıqlara Erwinia cinsinin bakteriyaları səbəb olur.

**Ləkələnmə.** Bəzi bakteriyalar (cins Pseudomonas), göbələklər (Ascomycetes sinfi və qeyri-

kamil göbələklər) yarpaqlarda, meyvələrdə, toxumlarda müxtəlif rənglərin, formaların, ölçülərdə ləkələrin əmələ gəlməsinə səbəb olur (şəkil 2).




**Şəkil 2**

**Şişlər.** Hüceyrə hiperplaziyası nəticəsində gövdə, budaqlar, köklər, rizomların çıxıntılar, şişkinliklər, qalınlaşmalar şəklində yerli böyüməsi.Bu xəstəlikləri bakteriyalar (Agrobacterium cinsi), göbələklər törədir.

Məlumdur ki, Azərbaycan Respublikası ərazisində uzun müddət mikrobioloji tədqiqatlar aparılmışvə bu dövrdə minlərlə göbələk növü müəyyən edilmişdir (Məmmədov, Xəlilov, 2002:56).

1. Abortipus borealis-Şimal qabarcığı adlanan göbələklərə tədqiqat zamanı cəmi iki dəfə rast gəlinib, yəni Bakı və Gəncə şəhərlərində abadlıq işlərində istifadə olunan ağac və kolların ümumi mikrobiotasının təsadüfi növləri hesab olunur. Göbələklər fitopatogenlərdir və ev sahibi bitkidə çürüməyə səbəb olur, bu da dağıdıcı çürüməyə səbəb olan rəngə malikdir.

2. Armillaria mellea-Yeməli göbələk kimi təsnif edilsə də, biotrofikdir və ağacda mövcud olan bütün əsas polimerlərin parçalanmasını kataliz etməyə qadir olan ferment sisteminə malikdir. Azərbaycanda ən çox yayılmış göbələklərdən biridir və ən çox yayılmış növləri enliyarpaqlı bitkilərdir.

3. Botrytis cinerea-Üzümdə boz çürüməyə səbəb olan bu göbələklə bağlı araşdırmalar tapılıb. Əvvəllər bu göbələk Azərbaycanda aparılan mikoloji tədqiqatlarda da aşkar edilib. Geniş substrat spesifikliyi ilə xarakterizə olunur.

4. Fomes fomentarius - Əsl göbələk kimi tanınan bu göbələk şəhərin abadlaşdırılması üçün istifadə edilən ağaclarda nadir hallarda rast gəlinir və tədqiqatlar zamanı adi qovaqda tapılıb. Lakin bu göbələk Azərbaycan meşələri üçün səciyyəvi olan ksilomikobiotaların ən ümumi və ekotrof xüsusiyyətlərinə görə əsl biotroflara aiddir (Bilay, 1982:46).

Təcrübələr ağacların mikrobiotasının formalaşması ilə bağlı patogen göbələk xəstəlikləri haqqında məlumatların əldə edilməsi, onların yayılması və Abşeron yarımadasının yaşıllaşdırma işlərində istifadə olunan bəzi patogenlərin inkişaf dövrlərinin öyrənilməsi məqsədilə aparılıb. Bu tədqiqatların aparılmasının əsas səbəbi ondan ibarətdir ki, göbələklərin törətdiyi bəzi xəstəliklərin zədələnmə dərəcəsini yaradan və bitkinin bioloji vəziyyəti, onların müəyyən ekoloji şəraitdə qarşılıqlı əlaqəsi, onların ərazisinin təbii iqlimi, flora və faunası müəyyən edir (Kovyazin, Minkevich, 2002:115).

Nəticədə müxtəlif iqlimlərdə yayılan göbələklər müxtəlif xəstəliklərə səbəb ola bilir. İnfeksiya və strukturların diqqəti yoluxmuş ağaclarda görünməyə başlayır. Meşə ağaclarının təhlükəli xəstəliklərdən kütləvi yoluxması və eyni zamanda qurudulmaq üçün geniş sahələrin yaradılması epitotiya adlanır. Efitotiya prosesinə üç amil təsir göstərir: yüksək infeksiya dərəcəsi, xəstəliklərə qarşı müqavimət vəəlverişli hava şəraiti və digərləri. Bu məsələlərin aydınlaşdırılması hər hansı bir ekosistemdə ağac və kolların mikoloji qiymətləndirilməsi üçün də vacibdir. Buna görə də göbələklərin və onların yaradıcılarının törətdiyi xəstəlikləri müəyyən etmək üçün tədqiqatlar aparılmışdır. Nəticələrdən məlumoldu ki, ən çox yayılmış xəstəlik müxtəlif növ göbələklərdə çürümə və ləkələnmədir (Muradov, Qəhrəmənova, Əliyev, Abbasov, 2009: 98).

## Nəticə

Nəticədə, Abşeron bitən ağac və kolların mikobiotasının formalaşmasında iştirak edən göbələklərin yüksək patogen potensialının aşkarlandığı qənaətinə gəlinmişdir. Qeydə alınmış

göbələklərin təxminən 72%-i yüksək patogen aktivliyə malikdir. Ağaclarda xəstəliklərə səbəb olan göbələklər haqqında məlumat aşağıda verilmişdir (Tikhonovich, Lugtenberg, Provorov, 2003):




Müxtəlif yaşlarda olan ağac və kolların assimilyasiya orqanlarının xəstəliyi tez-tez pas göbələkləri tərəfindən törədilir (Qorlenko, 1974: 91). Yarpaqların və iynələrin fotosintetik fəaliyyətini kəskin şəkildə zəiflədirlər və vaxtından əvvəl düşürlər. İynələrdə və yarpaqlarda parazitlik edən əsas pas qurdları heterojen formalardır. İynəyarpaqlıların vegetativ orqanlarına təsir edən paslardan ən zərərli xəstəlik şam əyiricisidir. Hər yaşda şam ağaclarını yoluxdurur, lakin ən böyük təhlükəni 2-10 yaşlı ağaclar üçün yaradır. İynələrə əlavə olaraq, filiallar təsirlənir - onlar əyilmişdir.

**Ədəbiyyat**

1. Kobzar, A. (2006). Tətbiqi riyazi statistika.
2. Korpaçinski, İ., Vostovskaya, T., Tomoşeviç, M. (2011). Asiya Rusiyasında ağac bitkilərinin tətbiqi ilə bağlı təcili vəzifələr.
3. Şipilova, N., Qavrilova, O., Qakayeva, T. (2014). Payızlıq buğda taxılının keyfiyyət xüsusiyyətlərinə Fusarium cinsinin göbələkləri ilə yoluxmasının təsiri.
4. Mustafazadə, N., Məhərrəmova, M., Qəhrəmanova, A., Qarayusifova, A. (2008). Yaşıllaşdırmada istifadə olunan ağac və kolların mikrobiotası və onların patogenləri.
5. Məmmədov, Q., Xəlilov, M. (2002). Azərbaycan meşələri. Bakı: Elm.
6. Bilay, V. (1982). Eksperimental mikologiyanın üsulları.
7. Kovyazin, V., Minkeviç, İ. (2002). Sankt-Peterburq və Puşkində yaşıl fəzaların ağac növləri, onların vəziyyətinin monitorinqi və onun yaxşılaşdırılması yolları.
8. Muradov, P., Qəhrəmənova, F., Əliyev, İ., Abbasov, D. (2009). Azərbaycan meşələrində ksilotrof makromisetlərin növ tərkibinin monitorinqi. “Biosistemlərin ekologiyası: öyrənilməsi, göstəricisi və proqnozlaşdırılması problemləri”. II Beynəlxalq elmi-praktik konfransın materialları.
9. Tikhonovich, I., Lugtenberg, B., Provorov, N. (2003). Molekulyar bitki-mikrob qarşılıqlı əlaqələri: keçmiş və gələcək arasında yeni biolges (redaksiya qeydləri).
10. Qorlenko, C. (1974). İntroduksiya olunmuş bitkilərin mikroflorası: avtoreferat.

Göndərildi: 12.07.2022 Qəbul edildi: 19.08.2022

DOI: https://doi.org/10.36719/2706-6185/14/24-31

**İsa Şahruddin oğlu Hüseynov**
Lənkəran Dövlət Universiteti
kimya üzrə fəlsəfə doktoru
isabey57@gmail.com
**Elnur İsrail oğlu Quliyev**
Lənkəran Dövlət Universiteti
magistrant
elnurquliyev823@gmail.com

# KİMYƏVİ HƏRƏKƏT FORMASININ KİMYƏVİ ÇEVRİLMƏDƏ ROLU

**Xülasə**

Məqalədə müasir dövrdə təhsilalanların kimya üzrə elmi-fəlsəfi dünyagörüşlərinin formalaşması üçün ətraf aləmdə baş verən fiziki və kimyəvi hadisələrin mahiyyətinə elmi-fəlsəfi istiqamətdən yanaşmalarının və kimyəvi proseslərin baş vermə səbəblərinin obyektiv reallıqlara söykənən dialektika qanunları əsasında həyata keçdiyini anlatmağın vacibliyindən danışılır. Kimyəvi hərəkətin baş verən kimyəvi çevrilmələrdə rolu, onun materiayanın digər hərəkət fomalarından fərqli cəhətləri, kimyəvi çevrilmələrdə kimyəvi rabitələrin əhəmiyyəti barədə məlumatların fəlsəfi mahiyyətinə geniş nəzər salınmışdır. Materiyanın kimyəvi hərəkət formasının daha dərindən anlaşılması üçün prosesin izahına quruluş yanaşması taktikasından əlavə genetik yanaşma taktikası da tətbiq olunmalıdır. Kimyəvi elementlərin əmələ gəlməsi prosesinə nəzər salmaqla görmək olar ki, materiyanın kimyəvi hərəkət forması zaman etibarilə atomdan sonra yaranmışdır və bu dövr subatom dövrü kimi elmi əhəmiyyət daşıyır. Kimyaya hansı təriflərin verilməsindən asılı olmayaraq onun kökündə maddələrin çevrilməsi anlayışı dayanır və bu da öz-özlüyündə kimyanın əsas mahiyyətini saxlamağa imkan verir.

***Açar sözlər:*** *kimyəvi hərəkət, kimyəvi çevrilmə, kimyəvi rabitə, kimyanın elmi fəlsəfəsi, materiyanın işıqvə istilik hərəkəti, subatom dövrü, bioloji hərəkət forması, dialektika*

**Isa Shahruddin Hüseynov**
Lankaran State University
Ph.D in chemistry
isabey57@gmail.com
**Elnur Israil Guliyev**
Lankaran State University
master student
elnurquliyev823@gmail.com

## The role of chemical motion form in chemical transformation

**Abstract**

The article talks about the importance of the scientific-philosophical approach to the essence of the physical and chemical phenomena occuring in the surrounding world in ordet to form the scientific-philosphical worldviews of the students in the modern era and to explain that chemical processes are carried out on the basis of the dialectical laws based on the objective realities of occurence. The role of chemical movement in chemical transformations, its differences from other forms of movement of matter, the importance of chemical bonds in chemical transformations, and the philosophical nature of the information have been extensively reviewed. In order to have a deeper understanding of the form of chemical movement of matter, in addition to the tactics of the structural approach to the explanation of the process, the tactics of the genetic approach should be applied. By looking at the process of formation of chemical elements, it can be seen that the form of chemical movement of matter arose after the atom in time, and this period is of scientific importance as the subatomic period. Regardless of what definitions are given to chemistry, at its root is the concept of the transformation of substances, which in

itself allows to maintain the main essence of chemistry.

***Keywords:*** *chemical processes, chemical conversion, chemical communication, scientific philosophy of chemistry, hght and heatmovement of matter, subatomic period, a form of biological action, dialectics*

## Giriş

Ölkəmizin təhsil müəssisələrində kimya fənninin tədrisinin əsasında yetişməkdə olan gənc nəslə kimyanın qanunauyğunluqlarını anlatmaq, gənclərin kimya elmi üzrə dünyagörüşlərini formalaşdırmaq və onların vətənpərvərlik ruhunda tərbiyə olunmasını həyat keçirmək məqsədi dayanır. Bunun üçün onlara maddi aləmin obyektiv birliyini təmin edən müxtəlif elmlərin qanunauyğunluqlarının öyrənilməsi bu elmlərin bir-birinə qovuşması şəraitində həyata keçirilir.

Təhsil müəssisələrində şagirdlərin və tələbələrin kimyada baş verən fiziki-kimyəvi hadisələrin fəlsəfi mahiyyətini anlamaları və onları tədris prosesndə tətbiq etmək bacarıqlarına sahib olmaları çox önəm daşıyan bir prosesdir. Kimyanın elmi fəlsəfəsi materiyanın kimyəvi hərəkət formasının kimyanın öyrənilməsində xüsusi əhəmiyyətə malik olmasını təsdiq edir. Buna görə də kimyanın tədrisi zamanı maddələrdəki istənilən hərəkətin kimyəvi hərəkət olmaması haqqında fikirlərə diqqət yetirmək lazımdır. Məs., atomun dayanıqlığını təmin edən atom nüvəsi ilə orbital elektronları arasındakı qarşılıqlı təsir, elektronların bir orbitdən digərinə keçməsi ilə baş verən hərəkət kimyəvi hərəkət formasına aid deyildir və bu hərəkət kvant enerjisinin udulması və ayrılması ilə müşaiyyət olunur. Bütün nüvə prosesləri elementar hissəcik səviyyəsində çevrilmələrə məruz qalmasına baxmayaraq, təbiət etibarilə kimyəvi hərəkət formasına daxil deyildir. Molekulda baş verən fırlanma və rəqsi hərəkətlər, molekul kütləsinin hərəkəti-istilik hərəkətidir və bu hərəkət forması da kimyəvi hərəkət formasını təsvir etmir.

Kimyəvi hərəkət formasının öyrənilməsinə diqqət etsək görərik ki, kimyəvi hərəkət konkret olaraq atomların nüvədən maksimum uzaqlıqda yerləşən xarici elektron təbəqəsindəki valent elektronların digər atomla qarşılıqlı təsir nəticəsində yerdəyişməsidir. Burada hərəkət eyni atomun elektronları və nüvəsi arasında qarşılıqlı təsir nəticəsində baş verməyib, yalnız bir və ya bir neçə atomun, atom qruplarının, molekulların valent elektronları- antiparalel spin vəziyyətində elektron cütləri hesabına həyata keçirilir. Yalnız bu şəraitdə elektronların duplet şəklində razılaşdırılmış hərəkəti nəticəsində reaksiyaya girən atomlar arasında mübadilə qüvvələri adlanan xüsusi qüvvələr yaranır və onlar da kimyəvi rabitəni həyata keçirir. Çünki yalnız bu cür qarşılıqlı mübadilə kimyəvi rabitənin baş verməsinəvə bununla da yeni kimyəvi maddənin yaranmasına imkan verir. Kimyanın tədrisində kimyəvi rabitələrin yaranması prosesinin izahında pedaqoq tərəfindən kimyəvi hərəkət formasını başa düşməyə imkan verən bu fəlsəfi tezislərin səsləndirilməsi çox vacibdir (Zhdanov, 1960).

Atomun tərkibindəki elektronların atomun tərkibindəki hərəkətdən fərqli olaraq molekulun yaranmasında iştirak edən hərəkət formasına keçməsi hər iki nüvə üçün ümumi olur və kimyəvi hərəkət formasının yaranmasına gətirib çıxarır. Kimyəvi birləşmənin əmələ gəlməsində iştirak edən elektronların sayəsində yeni yaranan molekulun fiziki-kimyəvi xassələrində keyfiyyət və kəmiyyət dəyişikliklərini yaranır. Buna görə də yeni maddə hissəciklərinin yaranması ilə fiziki-kimyəvi xassələrdə kəskin sıçrayışlı dəyişikliklər baş verir. Ayrı-ayrı atomlar üçün xas olan xassələr dəyişərək yeni yaranan maddəyə məxsus xassələr əldə edilir. Məs., natrium xörək duzunun tərkibində metallik natriuma xas olan xassələrdən məhrumdur. Elektronun bir hərəkət formasından digərinə keçməsi, istənilən keyfiyyət dəyişikliyinə oxşar olaraq bir-birinə əks olan hadisələrin qarşılıqlı təsirindən baş verir.

Kimyəvi maddə molekulu və ya hər hansı bir başqa hissəcik-radikal, ion daha yüksək mürəkkəb diskret səviyyədə formalaşmış molekuldur. Molekulun tərkibində onu əmələ gətirən atomlar və atom qrupları arasında spesifik qarşılıqlı təsir və kimyəvi əlaqə meydana gəlir. Bu da öz növbəsində molekulun digər keyfiyyət göstəricilərində və onun üçün xas olan qanunauyğunluqlarda özünü biruzə verir. Molekulun tərkibinə keçən atomların xassələri əhəmiyyətli dərəcədə kimyəvi quruluşun və qarşılıqlı təsirin xüsusiyyətlərindən irəli gələn dəyişikliklərə uğrayır. Burada atomların sadə mexaniki cəmini ifadə edən bir termin, anlayış yoxdur və buna görə də xassələrin də mexaniki cəmindən danışmaq olmaz. Atomların tərkibi bütün kimyəvi dəyişikliklərdə əsasən dəyişməz qalır və bu da materiyanın hərəkət formasını müəyyən edən əsas əlamətlərindən biri hesab edilir (Budreyko, 2005).

Həqiqətən də elementlərin atomları istənilən kimyəvi reaksiyalarda bir vahid kimi iştirak edirlər.

Onlar kimyəvi hərəkətə xas olan, maddənin özünəməxsus keyfiyyət quruluşunu təşkil edən çox kiçik hissəciklərdir. İlkin maddələrdən son məhsullara keçid zamanı maddəni təşkil edən atom qrupları parçalana bilir və bu zaman atomların özlərində hər hansı bir dəyişiklik baş vermir. Sadəcə yeni atom qruplarının əmələ gəlməsi ilə valent elektronların yenidən qruplaşması baş verir. Beələlklə, demək olar ki, atomların valent elektronlarının qarşılıqlı təsiri, hərəkəti nəticəsində müəyyən şərautdə materiyanın inkişafında əsaslı dəyişikliyə-kimyəvi rabitənin, daha mürəkkəb maddi quruluşun yaranmasına və sonrabu da özlüyündə daha yüksək hərəkət formasına-kimyəvi hərəkət formasına gətirib çıxarır.

Ensiklopedik biliklərə malik təcrübəli pedaqoq atomlar, elektronların hərəkəti, bir orbitdən digərinə keçmələrinin hansı fəsadlara yol açdığını elmi-fəlsəfi şəkildə izah edir, maddələrin yaranmasının səbəbolankimyəvi rabitənin formalaşmasının da məhz kimyəvi hərəkət sayəsində baş verməsinin fəlsəfi mahiyyətini açıqlayır.

Materiyanın digər hərəkət formalarını təsvir edərkən istilik və işıq hərəkəti barəsində də fikirləri çatdırmaq önəmlidir. Bu zaman izah edilir ki, kimyəvi proseslərdə baş verən dəyişikliklər istilik və işıq hərəkətləri ilə müşaiyyət olunan kimyəvi proseslərdir. Müşahidələr göstərir ki, bir çox hallarda istilik hərəkəti maddələrin çevrilməsi ilə müşaiyyət olunmur. Hər hansı bir qabadoldurulmuş istənilən qaz hissəcikləri, məs., $N_2O$ daim fəza yerdəyişməsi hərəkətindədir və qabın divarları ilə toqquşaraq ona təzyiq edir. Aydındır ki, bu zaman hər hansı bir kimyəvi çevrilmə baş vermir. Əksinə, istənilən kimyəvi reaksiya istiliyin udulması və ya ayrılması ilə, bəzən də işıq çıxması ilə müşaiyyət olunur. Beləliklə, yeni qarşılıqlı təsirə əsaslanan birləşmələrin çevrilmələri zamanı nəticə olaraq yenidən qruplaşma və ya köhnə rabitələrin dağılması və yeni rabitələrin əmələ gəlməsinin səbəbkarı və baçlıca müəyyənedicisi kimyəvi hərəkət forması hesab edilir. Digər hərəkət formaları isə proses zamanı yaranan prosesi müşaiyyət edən hərəkət formalarıdır (Hüseynov, Quliyev, 2022: 87-91).

İstilik, işıq və digər hərəkət formalarının kimyəvi hərəkət forması ilə əlaqəsinin öyrənilməsi zamanıməlum olmuşdur ki, onlar genetik olaraq qarşılıqlı əlaqədədirlər. Məs., işıq, istilik və elektrik hərəkətformaları ibtidai forma kimi kimyəvi hərəkət formasında iştirak edə bilərlər. Lakin kimyəvi hərəkət formasının yaranmasında bu sadalanan hərəkət formalarının rolu olmasına baxmayaraq kimyəvi hərəkətforması onlarda mövcud deyildir.

Materiyanın müxtəlif hərəkət formalarının uyğun elmlər tərəfindən öyrənilməsi zamanı müəyyən edilmişdir ki, bu hərəkət formaları nəinki bir-biri ilə uyuşmur, həmçinin eyni bir hərəkət formasının daxilində belə bəzi hərəkət formaları xüsusiləşmiş şəkildə olur. Məs., fizika mexaniki, molekulyar-istilik, elektrik və elektromaqnit, atomdaxili və nüvədaxili bəzi hərkət formalarını öyrənir. Bir qayda olaraq fiziki hadisələrdə bu hərəkət formalarında sıx qarşılıqlı əlaqə mövcuddur və onlar qarşılıqlı olaraq bir-birinə keçid edə bilirlər. Lakin kimyəvi hərəkət formasında bir qədər fərqli proseslər baş verir. Yəni kimyəvi hərəkət forması elektronların xüsusi qarşılıqlı mübadilə nəticəsində baş verən hərəkət formasıdır və bu hərəkət formasında atomlar kimi ionlar, radikallar, molekullar qarşılıqlı təsirdə olaraq tərkibcə, quruluşca və xassəcə bir-birindən kəskin fərqlənən maddələrin əmələ gəlməsinə gətirib çıxaran kimyəvi çevrilmə aktı hesab edilir (Dobrotin, 1967).

Formalaşmış elektron təbəqələrinə malik atomlar, ionlar, molekullar və radikallar kimyəvi hərəkətformasının maddi daşıyıcılarıdır. Atom, ion, molekul və sərbəst radikallardan savayı kimyəvi hərəkət formasının maddi daşıyıcıları qismində molekulyar komplekslər, kolloid hissəciklər, səth birləşmələri,bərk və maye fazalar, bir sıra aktiv komplekslər da mövcuddur və bu da V.Kuznetsovun elmi araşdırmalarında sübut edilmişdir. Adları çəkilən bu hissəciklər materiyanın elə bir səviyyəsini təşkil edir ki, bu səviyyədə müəyyən şəraitdə qarşılıqlı təsir yaranır və kimyəvi hərəkət forması fəaliyyət göstərir. Bu anlayışdan isə kimyanın öyrəndiyi maddənin çevrilməsi-bir kimyəvi hissəciyin digər kimyəvi hissəciyə çevrilməsi ilə baş verən kimyəvi çevrilmə anlayışı yaranır. Məhz bu çevrilmələr kimyəvi rabitələr əmələ gətirən valent elektronlarının yenidən paylaşması ilə baş verir.

Materiyanın kimyəvi hərəkət formasının daha dərindən anlaşılması üçün prosesin izahına quruluş yanaşması taktikasından əlavə genetik yanaşma taktikası da tətbiq olunmalıdır. Kimyəvi elementlərin əmələ gəlməsi prosesinə nəzər salmaqla görmək olar ki, materiyanın kimyəvi hərəkət forması zaman etibarilə atomdan sonra yaranmışdır və bu dövr ***subatom dövrü*** kimi elmi əhəmiyyət daşıyır. Belə ki, sadə kimyəvi çevrilmələr maddələrin yaranmasına gətirib çıxarmışdır. Materiyanın kimyəvi hərəkət formasının sonrakı inkişafı planetimizdə ***bioloji hərəkət formasına*** və beləliklə də həyatın yaranmasına gətirb çıxarmışdır. Bu barədə tədqiqatçı alimlər V.A.Ştof və R.B.Dobrotin birgə yazdıqları "Ümumi

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. İmpakt Faktor: 0.652. 2022 / Cild: 4 Sayı: 8 / 24-31 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. Impact Factor: 0.652. 2022 / Volume: 4 Issue: 8 / 24-31 e-ISSN: 2709-4197

kimya kursunda fəlsəfi məsələlərin ifadə olunması" adlı əsərdə aşağıdakıları qeyd etmişlər:

"Bütün yüksək səviyyələrdə kimyəvi hərəkət forması heç bir halda yoxa çıxmır, məhv olmur, sadəcəayrıca olaraq subatom formasında kimyəvi hərəkətdə olur".

Onlar həmin əsərdə qeyd etmişlər ki, kimyəvi proseslərin digər çevrilmələrdən bir sıra fərqləri mövcuddur və bu fərqlər enerji effektlərinin müqayisəsi zamanı daha qabarıq şəkildə üzə çıxır. Kimyəvi və kimyəvi olmayan çevrilmələrdə baş verən istilik effektlərinin fərqlərinə görə müəyyən mülahizələr irəli sürülmüşdür.Belə ki, kimyəvi hərəkətin baş verdiyi kimyəvi çevrilmələrdə, nüvə və faza çevrilmələrində eyni maddə müxtəlif istilik effektlərinə malik olur. Bunu aşağıdakı nümunədə qeyd edə bilərik:

1.Nüvə reaksiyası: $H^1 + H^2 \rightarrow H^2 + e + \gamma + 9.6 \cdot 10^6$ kkal

2.Faza çevrilməsi: H2 (qaz) → H2 (bərk) + 0.25 kkal

3.Kimyəvi çevrilmə: H + H → H2 + 104.2 kkal




***Şəkil 1. Kimyəvi hərəkət formasının lokallaşması (ştrixli sahələr)***

Bildiyimiz kimi birinci iki proses təbiət etibarilə kimyəvi proses hesab edilmir və fizika predmetinin mövzularına daxildir. Axırıncı-üçüncü proses isə sırf kimyəvi çevrilmədir və kimyada öyrənilir (Shtoff, Dobrotin, 1966).

R.B.Dobrotin ***"Kimyəvi hərəkət forması"*** əsərində göstərmişdir ki, kimyəvi reaksiyaların istilik effektləri vahidləri əsasən $10^2$ ilə 10 kkal arasında dəyişir. Bundan yuxarı sahədə nüvə çevrilmələri, bundan aşağıda isə faza çevrilmələri baş verir. Kimyəvi proses atom və molekulyar daşıyıcıların ölçülərinin $10^{-6}$ ilə $10^{-8}$ sm məsafə arasında yerləşməsi halında mövcud olur. Bu ölçülərdən böyük ölçülərdə sadə molekulyar və kolloidal və bioloji quruluşlar, ondan aşağı, yəni $10^{-12}$ və $10^{-14}$ sm ölçülərində isə nüvə proseslərində iştirak edən hissəciklər mövcuddur.

Kimyəvi hərəkət forması müəyyən temperatur, zaman və enerji hüdudlarında mövcud olur. Kimyəvi proseslərin xarakterik xüsusiyyətləri içərisində yer alan bir xüsusiyyəti qeyd etmək yerinə düşər. Belə ki, kimyəvi prosesdə ayrı-ayrı atom və molekullar deyil, onlarda əmələ gəlmiş maddə kütləsi iştirak edir. Buradan belə bir nəticə çıxır ki, hər bir reaksiya çoxlu miqdarda hissəciklərin qarşılıqlı təsirindənbaş verir. Belə bir nümunəyə nəzər salaq:

$$N_2 + 3H_2 \rightarrow 2NH_3 + Q$$

Bu kimyəvi reaksiya tənliyi ammonyakın hidrigen və azotdan alınması reaksiyasının tənliyidir. Bu tənlikdə reaksiya iştirakçılarının-reaksiyaya daxil olan ilkin kimyəvi maddələrin və reaksiya nəticəsində alınan reaksiya məhsullarının həndəsi hisbətlər qanununa görə bir mol ammonyakın alınmasına sərf olunan azotun və hidrogenin miqdarı ifadə olunur. Kimyəvi qarşılıqlı təsirdə iştirak edən maddələrin molekullarının sayının dəyişməsi kimyəvi prosesə yeni keyfiyyət xarakteri verir. Dobrotinə görə "Kimyəvi prosesdə iştirak edən molekullar toplusu konkret xüsusiyyətlərə malikdir və ayrı-ayrı molekulların xüsusiyyətlərindən köklü şəkildə fərqlənir. Məs., qazlarda kimyəvi reaksiya yalnız molekul toplusu olduğu halda mövcud olur. Beləliklə kimyəvi hərəkətə istənilən kimyəvi reaksiyadaiştirak edən atom, molekul və digər diskret hissəciklərə daxili xas olan spesifik ziddiyətərin nəticəsi kimi baxmaq olar".

Kimyəvi hərəkət formasının əsas ziddiyətləri iki istiqamət üzrə özünü biruzə verir:

1.***İnqilabi istiqamət*** adlanan 1-ci istiqamət-molekulların, komplekslərin, makromolekul və digər

kimyəvi hissəciklərin kvant-mexaniki sisteminin maddələrin termodinamik cəhətdən davamlı vəziyyət olan poensial enerjisinin minimumuna yaxınlaşması.

2. ***Konservativ istiqamət*** adlanan 2-ci istiqamət- tamamilə birincinin əksinə yönəlmişdir: bu sistemin kinetik olaraq əlverişli olmamasından irəli gəlir, çünki burada ***"energetik maneələr"***, ***"energetik quyular"*** mövcuddur və kimyəvi prosesdə onları aşmaq lazım gəlir.

Bu iki istiqamət üzrə aparılan analiz kimyəvi hərəkət formasın mahiyyətini açmaq üçün açar əldə etməyə imkan verir. Bu açar isə özbaşına hərəkət şəklində ifadə olunur. Sistemin özbaşına kimyəvi hərəkətinin ilkin səbəblərindən birinin sistemin daxilində enerji maneələrinin dəf edilə bilmə imkanlarının olmasıdır ki, bu da kənarda enerji verilmədən kimyəvi hərəkətə çevrilə bilir. İstənilən kimyəvi maddədə bunun baş verməsi üçün müxtəlif üsullar mövcuddur ki, maddəni təşkil edən elementlərin enerji maneələrini yarmaq mümkün olsun. Bu proses solvokataliz və ya avtokataliz nəticəsində aralıq kompleks birləşmələrin, o cümlədən elektronların tsiklik ötürüldüyü komplekslərin əmələ gəlməsi ilə baş verə bilər. Aşağıdakı tənlikdə bu prosesin necə baş verməsi ehtimalı qeyd olunmuşdur:

$$AB + CD \rightarrow AC + BD$$




***Şəkil 2.Kimyəvi prosesin mümkün sxemi***

Kimyəvi özbaşına hərəkət formasının fiziki mahiyyəti də mövcuddur və onu aşağıdakı kimi ifadə etmək olar: valent elektronlarının dalğa funksiyası adiabatik olaraq a-dan в-yə sıçrayışla aralıq kompleks – б əmələ gətirməklə diskret keçid etməyə imkan verir. Müxtəlif kimyəvi proseslərdə-oksidləşmə-reduksiya və turşu-əsas proseslərində meydana çıxan ziddiyətlər özləri də fərqlidir və konkret hər hansı bir ziddiyətin dərki həmin prosesin özünün dərkinə yol açır, başqa sözlə desək bu elə o prosesin dərki deməkdir. Beləliklə, tam inamla demək olar ki, materiyanın keyfiyyətcə xüsusi hərəkət forması olan maddələrin çevrilməsini öyrənən kimya elmi özünün predmeti və öyrənmə metodları, özünün spesifik kimyəvi element, kimyəvi maddə, funksional qrup və s kimi anlayışları olan elmdir və o öz qanunlarını-dövri qanun, kimyəvi quruluş qanunu, valentlik prinsipi kimi qanuları formulə edir, hipotez və teoremlərini quraraq dərketməni asanlaşdırır (Kratkaya khimicheskaya ettsiklopediya, 1964). Təbiətşünaslığın inkişafı nəticəsində 18-19-cu əsrlərdə nisbilik və kvant mexanikası nəzəriyyələri formalaşdı və bu və ya digər yeni nəzəriyyələr dialektikanın fizika və kimya elmlərindəki hakimiyyətini təsdiq etmiş oldu. Elmlərin inkişafı ilə kimyanın digər elmlərlə-fizika, biologiya və riyaziyyatla qarşılıqlı əlaqəsi bir çox sirlərin açılmasına, kimyanın dialektik dərkinə şərait yaratdı. R.Boyl, M.Lovonosov və Lavuazyedən başlayaraq kimyanın maddələr və onların çevrilmələri haqqında elm olması birmənalı olaraq qəbul edildi. Q.Remi, N.Nekrasov, N.Qlinka və İ.Putilova kimi dərslik müəllifləri olan alimlər kimyəvi çevrilmənin mahiyyətini açmaq, kimyanın tərifini vermək üçün kimyəvi reagentlərin və reaksiya məhsullarının tərkibi, quruluşu və xassələrinin dəyişməsi, reaksiya şəraiti və qanunauyğunluqlardan istifadə etməyə çalışmışlar. İ.Putilovanın ümumi redaktorluğunda dərc edilmiş "Ümumi kimya" dərsliyində kimyaya belə bir tərif verilmişdir: "Kimyanın predmetini həmçinin bütün kimyəvi proseslərə xas olan kimyəvi və digər enerji formalarının qarşılıqlı çevrilmələri təşkil edir" (Putilova, 1964).

Lakin kimya elmi haqqında bu deyilənlər barəsində ən doğru məlumatları amaerikalı alim L.Polinq vermişdir. O, deyirdi: "Kimya maddələr haqqında elmdir. Kimyəvi reaksiyalarda onların quruluşu, xassələri öyrənilir və kimyəvi proses nəticəsində bir maddə başqa bir maddəyə çevrilir. O burada dərhal qeyd edir ki, bu deyim özü də dar və geniş çərçivədə anlaşıla bilər. Dar çərçivə dedikdə maddəni öyrənən kimyaçı maddəni öyrənməklə üşıq enerjisisni-işıq şüasını, rentgen

şüasını, radiodalğaları maddə ilə qarşılıqlı təsirdə öyrənməlidir. Geniş çərçivə dedikdə L.Polinq kimyəvi və fiziki proseslərin sıx əlaqəsinə işarə edir və bunlar faktiki olaraq bir-birindən ayrılmaz hissələrdir və digər elmlərin sahələrinə də nüfuz edir" (Poling, 1964).

Elə indinin özündə də kimyaya daha dəqiq tərif verilməsinə dair cəhdlərrin ardı kəsilməyib. Lakin istənilən halda qəbul edilən yeniliklər hökmən klassik kimya anlayışına gölgə salmaq iqtidarında olmayacaqdır. İndiki zamanda kimya sahəsində toplanan çoxlu sayda nəzəri və eksperimental materiallardan istifadə edərək kimya anlayışını daha da dərinləşdiməyə və inkişaf etdirməyə cəhd edənalimlər kifayət qədər çoxdur. Məs., Y.A.Jdanov kimyəvi quruluş nəzəriyyəsi, üzvi kimyada inqilab edən izomerliyin kəşfi, maddələrin yeni quruluşları və xassələrini nəzərə alaraq kimyaya cisimlərin miqdari tərkibi və quruluşunun təsiri altında keyfiyyət xassələrini dəyişmələri haqqında elm olması fikrini irəli sürmüşdür. Kimyanın bu cür tərifi onun mahiyyətini, kimyəvi çevrilmələrin mexanizmini daha dərindənaçmağa, dərk etməyə imkan verir (Budreyko, 2005).

Görkəmli alim Y.A.Gerasimov da kimyaya müasir tərif verməyə cəhd etmişdir. Belə ki, onun fikrincə "kimya maddənin xassələrinin molekulun quruluşu və tərkibi, həmçinin eyni zamanda bu xassələrin molekulun tərkibi və quruluşunun dəyişməsi ilə əlaqəsi olan elmdir" (Gerasimov, 1963).

Y.A.Gerasimov kimyaya verdiyi bu müasir təriflə bəzi məsələlərin üzərinə işıq salmağa müvəffəq olmuşdur. Belə ki, onun deyiminə diqqət versək görərik ki, o molekulu daha geniş çərçivədə görür və təqdim etməyə çalışır. Çünki molekulyar vəziyyətə həm də ion kristalları və məhlullar malikdir. Buna görə də kimyanın əsas məsələlərindən birinin də məhz molekulunun xassələrinin onun kimyəvi quruluşundan, yəni molekulun tərkibindən, rabitələrin ardıcıllığından və onların qarşılıqlı təsir xüsusiyyətlərindən asılı olmasıdır. Bu fikirlərə əsasən kimyəvi reaksiyanın getməsinin başlıca şərti molekul adlanan spesifik material quruluşun olmasıdır və M.İ.Şahparonov da bu mülahizəni dəstəkləyən alimlər sırasında yer almışdır.

B.M.Kedrov da bu istiqamətdə müəyyən işlər görmüşdür və o da kimyəvi hərəkət formasına molekulun tərkibindəki atomların molekulun parçalanması və ya qarşılıqlı çevrilmələr zəminində baş verən yerdətişməsinin nəticəsi kimi baxır və bununla da alim düşüncələrində özündən əvvəlki tədqiqatçıların fikirlərinə dəstək verir (Kedrov,1962).

Y.I.Gerasimov və B.M.Kedrovun irəli sürdükləri mülhizələr obyektiv və konkret olaraq kimyəvi çevrilmələrin mahiyyətini ifadə etməsinə imkan verməsinə baxmayaraq bu fikirlərin düz olmayan cəhətləri də var. Belə ki, reaksiyada iştirak edən bütün maddələr molekulyar vəziyyətdə olmadıqları məlumdur və bu şəraitdə bu mülahizə özünü bir qədər doğrultmur. Belə bir fikir mövcuddur ki, molekul anlayışı metallik və ion kristallarına, həmçinin çoxlu miqdarda səth maddələrinə tətbiq edilmir. Çünki metallar, ərintilər, ion və atom kristalları, həmçinin onların ərintiləri kimi cisimlərdə molekul mövcud deyildir və burada da atomlar və ionlar bütün qonşu atomlar və ionlarla təxminən eyni qarşılıqlı təsirdə olur. Bu cisimlərin tərkibinə molekullardan deyil, müsbət və mənfi yüklər daşıyan ionlardan təşkil olunmuş maddələr kimi baxmaq lazımdır. Buna görə də kimyəvi hərəkət formasına yuxarıda səslənən molekulların tərkibindəki atomların qarşılıqlı təsiri səbəb olur fikri bir qədər şübhə doğurur. Çünki molekul olmadığı yerdə aydın məsələdir ki, onun tərkibi də yoxdur, atomların qarşılıqlı təsiri də bu səbəbdən mövcud ola bilməz.

Bu məsələlərə aydınlıq gətirilməsi üçün kimyanın və ona yaxın elmlərin maddələrin müxtəlif aqreqathalları və kristal formaları barədə daha müasir nəzəriyyələrlə silahlanması zərurəti yaranmışdı və o daöz zamanını gözləyirdi. İndiki zamanda kimyanın maddələrin çevrilməsi kimi başa düşülən bir tərifdənimtina edilməsi düzgün deyildir və sadəcə hası çevrilmələrin baş verməsini aydınlaşdırmaq zəruridir. Başqa sözlə desək, "kimyəvi çevrilmə" anlayışını bir qədər də dərindən öyrənmək və dəqiqləşdirmək lazımdır. Bu maddənin elə çevrilməsi olmalıdır ki, nəticədə onun quruluşu, tərkibi, xassələri dəyişməlivə yeni quruluş yaranmaldır. Kimyəvi çevrilmələr atomlar səviyyəsində maddənin atom, molekul, ion və radikal kimi hissəciklərinin xüsusi qarşılıqlı təsirləri nəticəsində xüsusi rabitələrin yaranması və yayenidən paylanması ilə baş verir.

Kimyaya hansı təriflərin verilməsindən asılı olmayaraq onun kökündə maddələrin çevrilməsi anlayışıdayanır və bu da öz-özlüyündə kimyanın əsas mahiyyətini saxlamağa imkan verir. Sadəcə elmə yeni məlumatların daxil olması ilə hansı çevrilmələrdən söhbət getdiyi açıqlanmalıdır. Yəni ***kimyəvi çevrilmə*** məhfumunun mahiyyəti dərk edilməlidir. Qeyd edilməlidir ki, bu elə bir çevrilmədir ki, bununbaş verməsi aşağıdakı kimyəvi proseslərə gətirib çıxarır:

1.Çevrilmə nəticəsində maddənin quruluşu, tərkibi, bəzən də hər ikisi birgə, xassəsi xüsusi kimya qanunauyğunluqları əsasında dəyişir.

2. Kimyəvi çevrilmə atom səviyyəsində-aşağı həddə baş verir və maddənin müəyyən quruluş hissəciklərinin-atomlar, molekullar, radikallar və ionların xüsusi qarşılıqlı təsirindən baş verir.

3. Kimyəvi çevrilmə spesifik kimyəvi rabitələrin yaranması ilə müşiyyət olunur. Bu şərtin yerinə yetirilməsi də kimyəvi çevrilmələrin digər çevrilmələrdən-geologi, nüvə çevrilmələrindən fərqləndirməyə imkan verir.

Nobel mükafatı laureatı, dahi alim N.N.Semyonov özünün "Zəncirvarıı reaksiyalar" kitabında qeyd edirdi ki, "kimyəvi çevrilmə, kimyəvi reaksiya kimyanın əsas predmeti olaraq qalır". Elementləri, ələlxüsus da atom və molekulların quruluşlarını öyrənməklə, quruluş və xassələrin əlaqəsini də öyrənmək mümkündür. Bunun üçün isə müxtəlif elmlərin metodlarında istifadə olunur. Fizika kimya üçün köməkçi material verir ki, bu da kimyəvi çevrilmələrin rasional idarə olunmasını həyata keçirməyəvə əsas vəzifələri yüngülləşdirməyə şərait yaradır (Semenov, 1934).

N.N.Semyonovun bu tərifinin üstünlüyü ondadır ki, burada həm baş verən çevrilmənin xüsusiyyəti, həm də onun öyrənilməsinin kimya  üçün xüsusi əhəmiyyətə malik olması qeyd edilir. Bu isə birbaşa dialektik materializmin materiyanın hərəkət formalarının qarşılıqlı əlaqələrinin prinsipləri ilə uyğun gəlir, yüksək forma tabeli aşağı forma ilə müşaiyyət olunur. Məs., kimyəvi forma fiziki, bioloji forma kimyəvi və fiziki formalarla müşaiyyət olunur. Bu isə kimyanı digər elmlərlə sıx bağlayır  və kiyəvi çevrilmələri işıq, radiasiya, dalğa və istilik hərəkəti kimi digər hərəkət formaları ilə qarşılıqlı əlaqə şəaitində öyrənilməsini tələb edir.

Kimyada atomların elektron quruluşları və molekulyar təbəqələr haqqında nəzəri materialların yer alması nəticəsində M.Butlerovun kimyəvi quruluş nəzəriyyəsinin və V.Markovnikovun "Atomların molekulda qarşılıqlı təsiri" nəzəriyyəsinin meydana gəlməsi qaçılmaz reallığa çevrildi. Bu nəzəriyyələr yaranmasına təkan verən amillərdən biri molekulda atomların qarşılıqlı təsirdə olmaları üçün kimyəvi rabitənin elektrostatik təbiətə və daha sonra elektron təbiətli olması haqqında mülahizələr olmuşdur.Burada kimyəvi rabitə kimyanın əsas mərkəz problemi kimi ortaya çıxır. Buna görə bir çox kimyaçılar haqlı olaraq düşünürlər ki, kimyəvi rabitənin təbiətinin və xüsusiyyətinin, onun əmələgəlmə və parçalanma qanunauyğunluqlarınınn açılması, həm də onun çevrilməsinin mexanizminin və dolayısı iləkimyəvi hərəkət formasının mahiyyətini açır.

Y.İ.Gerasimov öz tədqiqatlarında da məhz kimyəvi çevrilmələrdə iştirak edən kimyəvi rabitələrin az öyrənilməsi səbəbindən kimyəvi çevrilmələrin mahiyyətini tam izah etmək mümkün deyildir fikrini bununla əsaslandırıdı. Bu da bəzən kimyəvi proseslərin fiziki hadisələr kimi qələmə verilməsinə səbəb olurdu. Lakin kimyaya kimyəvi rabitələr üzərindən yürümə müasir kimyanın ən vacib momentlərindən birinin- fiziki və kimyəvi hadisələrin əlaqəsi və keyfiyyətcə fərqliliyini aydınlaşdırmağa imkan verir.Məhz elektronların keçidi ilə kimyəvi rabitələrin əmələ gəlməsi və bir hərəkət formasının digərinə keçməsi müşahidə olunur.  Bununla da kimyada kimyəvi çevrilmənin baş verməsində kimyəvi rabitələrin rolunun əhəmiyyəti qeyd olunur, maddənin tərkibinin, xassəsinin, reaksiya qabiliyyətinin kimyəvi rabitələrin tipindən nə qədər asılı olduğunu göstərir.

M.Butlerovun əsas xidmətlərindən biri 100 ildən artıq bir dövrdə əsaslı dəyişikliyə uğramadan üzvibirləşmələrin quruluşunu ifadə edən "Üzvi birləşmələrin quruluş nəzəriyyəsi"ni yaratması oldu. Markovnikov isə atomların molekuldakı qarşılıqlı təsiri kimyəvi rabitənin elektrostatik və elektron xarakteri daşıdığını ifadə edərək burada kimyanın əsas, mərkəzi probleminin kimyəvi rabitə hesab olunduğunu qeyd etmişdir. Buradan belə bir fikir söyləmək mümkündür: "Kimya cisimlərinin daxili quruluşun dəyişməsi ilə, yəni atomların qarşılıqlı təsiri və qarşılıqlı təsir dərəcəsinin dəyişilməsi ilə cisimlərin özlərinin dəyişməsi və yaxud da atomlar arasında rabitələrin yenidən paylaşması ilə baş verən maddələrin çevrilməsi haqqında elmdir" (Budreyko, 2005).

V.İ.Kuznetsov "Kimyanın əsas qanunları inkişafı haqqında təssəvvürlər" əsərində özündən öncəkisələflərinin kimya barəsindəki bütün deyilənləri əsas götürərək kimya haqqında aşağıdakıları söyləmişdir:

"Kimya maddələrin atomları arasındakı valent qarşılıqlı təsir dərəcələrinin dəyişməsi nəticəsində başverən çevrilmələr haqqında elmdir" (Kuznejhov, 1967).

Kimyanın predmeti haqqındakı bu fikirlər bu günkü gün üçün də aktuallığını itirməmiş, xüsusi əhəmiyyət daşıyır və kimyanın müasir tərifini daha dolğun ifadə etməyə və daha dərindən araşdırmağa və inkişaf etdirməyə imkan verir.

Kovalent rabitə məlum olduğu kimi müəyyən qədər fəza istiqamətlidir. Bundan başqa, kimyəvi rabitənin əmələ gəlməsi müəyyən zaman kəsiyində baş verən prosesdir və buna görə də kimyanı maraqlandıran əsas məsələlər içərisində kimyəvi rabitələrin fəzada və müəyyən zaman kəsiyində

yenidən paylanması, parçalanması kimi məsələlər xüsusi əhəmiyyət daşıyır. Bu proseslərdə reaksiyaya daxil olan hissəciklərin valent elektronları iştirak edir və bu da kimyanı kavant kimyası üzərindən öyrənilməsinin vacib olduğunu göstərir.

Reaksiyaya girən maddələrin valent elektronlarının proseslərdə iştirakını nəzərə alaraq deyə bilərik ki, kimya, əsasən də onun yeni bölməsi olan kvant kimyası maddə hissəciklərinin valent elektronlarının həm öz aralarında, həm də bu hissəcikləri təşkil edən atomlar arasındakı qarşılıqlı təsiri və bunun nəticəsində maddələrin xassələrində, tərkibində və quruluşunda baş verən dəyişiklikləri öyrənən elm olması fikrini söyləmək mümkündür. Bu məsələlər elektron prosesləri baxımından maddənin kimyəvi çevrilməsini ifadə edir. Ona görə də elektron sıxlığının yenidən bölüşdürülməsi ilə bir rabitənin dağılması və digər rabitənin əmələ gəlməsi baş verir ki, bu da kimyəvi reaksiyanın kimyəvi hərəkət formasını ifadə edir. Bu cür yanaşma materiyanın hərəkət forması olan kimyəvi hərəkətin həm fiziki, həm də kimyəvi mahiyyət daşıdığından xəbər verir. Beləliklə, demək olar ki, fiziki və kimyəvi hərəkət formaları fəlsəfənin səbəb-nəticə münasibətlərindən doğur və onlara da səbəb-nəticə prizmasından yanaşılması daha doğrudur. Belə münasibətlər bir qayda olaraq dialektik xarakterlidir və səbəbdən nəticəyə və əksinə keçən keyfiyyət dəyişiklikəri ilə müşaiyyət olunur.

Valentlik, onun istiqamətliliyi və doymuşluğu kimi kimyəvi hadisələr dərin fiziki mahiyyətə malikdir və ona görə də onların izahını elementar hissəciklər olan elektronların xassələrində və hərəkət qanunauyğunluqlarında axtarmaq lazımdır. Lakin elektronlara kimyəvi qanunauyğunluqlar xas deyildirvə ya da da bu qanunauyğunluqlar keyfiyyətcə tamamilə yenidir və kimyəvi çevrilməyə gətirib çıxaranhissəciklər arasında qarşılıqlı təsirlər nəticəsində yaranır.

## Nəticə

Tədris prosesində pedaqoq materiyanın kimyəvi hərkət formasını yuxarıdakı qaydada, ardıcıl və anlaqlı şəkildə izah etməklə, kimyəvi proseslərin xarakterik xüsusiyyətlərinin məhz kimyəvi hərəkətdən yaranmasını, bu prosesdə atomlararası qarşılıqlı təsirlərin, valentlik dərəcəsinin dəyişilməsi, elektron keçidlərinin baş verməsi və bunun maddənin xassələrində, quruluşunda və tərkibində necə əks olunması, kəmiyyətin keyfiyyətə keçməsi, fəlsəfənin səbəb-nəticə anlayışları barədə əsas fikirləri, həmçinin kimyəvi hərəkətin materiyanın əsas formalarından olması fikrini asan şəkildə auditoriyaya çatdırmağa müvəffəq olur.

## Ədəbiyyat

1. Zhdanov, Yu. (1960). Ocherki metodologii organicheskoy khimii. Moskva.
2. Budreyko, N. (2005). Philosophical questions of chemistry. Graduate School.
3. Hüseynov, İ., Quliyev, E. (2022). "Kimyanin və kimyəvi hərəkət formasının dialektikası". Elmi İş. beynəlxalq elmi jurnalı. VII Respublika Elmi Qaynaqlar Konfransının Materialları. Bakı. s. 87-91.
4. Dobrotin, R. (1967). The chemical form of movement. LGU.
5. Shtoff, V., Dobrotin, R. (1966). Izlozhenii voprosov filosofii v kurse obshey khimii. Moskva.
6. Kratkaya khimicheskaya ensiklopediya. (1964). Moskva. T.3.
7. Putilova, I. (1964). Kurs obshey khimii. Moskva.
8. Poling, L. (1964). Obshaya khimiya. Moskva.
9. Gerasimov, YA. (1963). The chemical form of the motion of matter, its connection with other forms of motion. Subject chemistry. Bulletin. MGU.
10. Kedrov, V. (1962). Predmet i vzaimosvyaz estestvennıkh nauk. Moskva.
11. Semenov, N. (1934). Tsepnıe reaktsii. Moskva.
12. Kuznejhov, V. (1967). Evolyutsiya predstavleniy ob osnovnıkh zakonakh khimii. Mir.

Göndərildi: 15.07. 2022 Qəbul edildi: 19.08. 2022

DOI: https://doi.org/10.36719/2706-6185/14/32-39

**Nurlanə Hümmət qızı Məmmədova**
Azərbaycan Milli Elmlər Akademiyası
doktorant
memmedovanurlane89@gmail.com

# MƏSUD ƏLİOĞLUNUN TƏNQİDİNDƏ "ATALAR VƏ OĞULLAR" MÖVZUSU

**Xülasə**

Bədii ədəbiyyatın hər bir mərhələsində ata ilə oğul arasında olan münasibətlər qələmə alınmışdır. Qədim və orta əsrlər ədəbiyyatına aid mətnlərdə təsadüf etdiyimiz bu mövzu tarixi şəraitin tələblərindən asılı olaraq XIX əsrdə başqa bir məzmun ifadə etməyə başladı. Belə qənaətə gəlirik ki, XIX əsri dönüş nöqtəsi kimi götürə bilərik. Bu mövzuya tədqiqatlarında yer verən ədəbiyyatşünaslarımızın içərisində Məsud Əlioğlunun araşdırması xüsusilə seçilir. Sərlövhəsi simvolik mahiyyət daşıyan "Atalar və oğullar" məzmunlu məqalələrdə iki nəsil arasındakı fikir konflikti diqqət mərkəzinə çəkilir. O, təkcə ata-oğul münaqişəsindən danışmır, bu mübarizəni köhnə ilə yeninin mübarizəsi kimi götürürdü. Belə ki, tənqidçi əsərlərində yalnız mühafizəkar ataları deyil, həyatda yolunu tapa bilməyən, təhsildən, elmdən xəbərsiz oğulları da tənqid etmişdir. Məqalədə ata-oğul münasibətlərinin aydınlaşdırılmasında tərbiyə və mühit amili, böyüklərə hörmət, müsbət qəhrəman problemi təhlil ediləcəkdir.

***Açar sözlər:*** *Məsud Əlioğlu, tənqidçi, müsbət qəhrəman, mühit, yenilik*

**Nurlana Hummat Mammadova**
Azerbaijan National Academy of Science
PhD student
memmedovanurlane89@gmail.com

## The topic of "Fathers and Sons" in Masud Alioglu criticism

**Abstract**

The relationship between father and son is written in every stage of literature. Depending on the requirements of the historical conditions, this theme, which we encounter in the texts of the ancient and medieval literature, began to express a different content in the 19th century. We conclude that we can take the 19th century as a turning point. Masud Alioglu's research is particularly distinguished among our literary critics who have given space to this topic in their research. The articles with the symbolic title "Fathers and Sons" focus on the conflict of ideas between the two generations. He did not only talk about the father-son conflict, he took this struggle as a struggle between the old and the new. Thus, in his works, the critic criticized not only the conservative fathers, but also the sons who could not find their way in life and were ignorant of education and science. The article will analyze the upbringing and environment factor, respect for elders, and the problem of a positive character in the clarification of father-son relations.

***Keywords:*** *Masud Alioglu, critic, positive character, environment, innovation*

## Giriş

"Atalar və oğullar" məsələsi ədəbiyyatımızda həmişə aktual olub. Çünki zaman, dövr dəyişir. Nəsillər bir-birini əvəz etdiyi kimi, mühitə, cəmiyyətə münasibət də dəyişir, yeniləşir. Oğullar ataların ənənələrini davam etdirməklə yanaşı, onların da öz yolu və həyat idealı olur. Bu prosesdə, şübhəsiz ki, nəsillərin mövqeyi bir çox hallarda üst-üstə düşmür. Hətta bəzən ziddiyyətlər meydana çıxır ki, bədii yaradıcılıqda bütün bunların necə əks olunduğunu görürük. Azərbaycan ədəbiyyat tarixinə nəzər salsaq, "Atalar və oğullar" arasındakı münasibətin təsvirini ardıcıllıqla bu cür izah edə bilərik:

a) Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatında "atalar və oğullar"
b) Maarifçi-realist ədəbiyyatda "atalar və oğullar"
c) XX əsrin əvvəllərində yazılan əsərlərdə "atalar və oğullar"
d) ç) Sovet dövrü Azərbaycan ədəbiyyatında "atalar və oğullar"

XIX əsrə qədər olan əsərlərdə oğula nəsihət verən, yol göstərən, oğulun yenilik duyğusu ilə barışan ata obrazı tərənnüm olunurdu. Klassik irsdə ata ilə oğul arasındakı münasibətin bu şəkildə təzahürünü Məhəmməd Füzulinin "Leyli və Məcnun", "Fəzliyə nəsihət", "Rindü Zahid" əsərlərində görə bilərik. Fikrimizcə, qədim və orta əsrlər Azərbaycan ədəbiyyatında ata ilə oğul arasında olan münasibət bədii əsərlərdə problem səviyyəsində qoyulmamışdır. Çünki bu əsərlərdə övlad tərbiyəsi məsələsi, övladın gələcəyindən narahat olan ata obrazı tərənnüm olunmuşdur. XIX əsrdə tarixi şəraitin nəticəsi olaraq, atalar və oğullar münasibətində yeni təzahürlər üzə çıxır, atalar və oğullar ortaq məxrəc tapa bilmir, atanın tələbi oğulun yenilik duyğusu ilə uyğun gəlmir. Bu təsirlə formalaşan gənc nəslin yeni həyat arzusu mühafizəkar atalar üçün arzuolunmaz bir məsələyə çevrilir. Mühafizəkar ataların yenilik tərəfdarı oğullara qarşı apardığı mübarizə ədəbiyyatdan da yan keçmir. Mülkədar ataya qarşı çıxan ideal oğul "atalar və oğullar" məsələsini ortaya çıxarır. Azərbaycan ədəbiyyatında "Atalar və oğullar" probleminə ilk toxunan Mirzə Fətəli Axundzadə olur. Onun "Hekayəti-müsyo Jordan həkimi-nəbatat və Dərviş Məstəli şah cadukünі-məşhur" əsərinin qəhrəmanı Şahbaz bəyin timsalında ədəbiyyatda açıq fikirli gənclər yetişir.

"Atalar və oğullar" XIX əsrdən bədii əsərlərin əsas mövzularından olsa da, tədqiqat predmeti kimi az araşdırılmışdır. Məsud Əlioğlunun da qeyd etdiyi kimi, Mir Cəlalın, Məmməd Arifin, Məmməd Cəfərin tədqiqatlarında bu məsələ müəyyən qədər işıqlandırılsa da, ayrıca mövzu kimi tədqiqat predmeti olmamışdır. İlk dəfə Məsud Əlioğlu bu məsələyə sistemli şəkildə toxunmuşdur (Vəliyev, 1959; Əlioğlu, 1961; Əlioğlu, 1961).

XIX əsrin 50-60-cı illərində müsbət qəhrəman yaratmaq ənənəsi ədəbiyyatda aktual bir məsələyə çevrildi. Bu cəhət ədəbi tənqiddən də yan keçmədi. Tarixi inkişafın hər mərhələsi üçün əhəmiyyətli olan "Atalar və oğullar" mövzusu həmin dövrdə müsbət qəhrəman yaratmaq ənənəsinə xidmət edirdi. Məsud Əlioğlunun araşdırmalarında bu məsələyə geniş yer verilmişdir. Sovet hakimiyyəti illərində öz sinfi kökünə qarşı mübarizə aparan mülkədar oğullar qələmə alınmağa başlanır. Bu yeni istiqamətin bədii qəhrəmanı Süleyman Sani Axundovun "Laçın yuvası" əsərinin Cahangir ağa obrazı idi. Azərbaycan ədəbiyyatında XIX əsrdə başlayan atalar və oğullar problemi bu əsərdə yeni istiqamətdə özünü göstərirdi. Məsud Əlioğlu XIX əsrdə yetişən oğullarla XX əsrin oğulları arasındakı fərqi belə ümumiləşdirirdi: "XIX əsrin oğulları atalarına – köhnəliyi təmsil edənlərə qarşı mübarizədə zəif idilər və bu səbəbdən də məğlub oldular. Yeni əsrin, inqilab əsrinin oğulları isə onlardan tamamilə fərqlənirdi. Bunlar mübarizədə xalq kütləsinə arxalandılar" (Vəliyev, 1955: 144).

Tədqiqatçı problemi xronoloji ardıcıllıqla izləmiş, həm dramaturgiyada, həm də nəsrdə işlənmə xüsusiyyətlərinə nəzər salmışdır. O, tarixilik baxımından bu mövzunu iki hissədə təhlilə cəlb etmişdir:

1.1850-ci ildən 1930-cu ilə qədər yazılan dram əsərlərində "Atalar və oğullar"

2.1930-cu ildən sonra yazılan nəsr əsərlərində "Atalar və oğullar"

Bu bölgüdən görürük ki, tədqiqatçı atalar və oğullar arasında olan münasibətin problem səviyyəsində araşdırılmasına XIX əsrdən başlamışdır. Birinci hissədə Mirzə Fətəli Axunzadənin "Hekayəti-molla İbrahimxəlil Kimyagər", "Hekayəti-müsyo Jordan həkimi-nəbatat və Dərviş Məstəli şah cadükuni- məşhur", Nəcəf bəyVəzirovun "Ev tərbiyəsinin bir şəkli", "Adı var, özü yox", "Yağışdan çıxdıq, yağmura düşdük", "Sonrakı peşmançılıq fayda verməz", "Müsibəti-Fəxrəddin", Əbdürrəhim bəy Haqverdiyevin "Dağılan tifaq", "Bəxtsiz cavan", Cəlil Məmmədquluzadənin "Ölülər", "Anamın kitabı", Cəfər Cabbarlının "Aydın", "Oqtay Eloğlu", Nəriman Nərimanovun "Nadanlıq", "Bahadır və Sona", Süleyman Sani Axundovun "Laçın yuvası" əsərləri, ikinci hissədə isə Süleyman Rəhimovun "Şamo", Yusif Vəzir Çəmənzəminlinin "Studentlər", Əbülhəsənin "Dünya qopur", "Yoxuşlar", Əli Vəliyevin "Qəhrəman" romanları tədqiqata cəlb edilmişdir. Tənqidçi Şahbaz bəy obrazı vasitəsilə ədəbiyyata gələn maarifçi nəsli, Fatma xanım və Sərvinaz xanım surətləri vasitəsilə qaynana-gəlin konfliktini, Fəxrəddin, Fərhad bəy, Ömər obrazı əsasında başqa ölkələrdə təhsil alıb Vətənə qayıtdıqdan sonra mülkədarlığa xas qaydaları dəyişmək istəyən gənc nəsli təhlil edirdi. İsgəndər, Aydın, Oqtay kimi oğulları "Qəribə adamlar", "Anamın kitabı" əsərinin üç qardaşını "Daxili düşmənlər" adlandırırdı. Şamo, Fərzəli, Hümmət, Heybət, Rüstəmbəy, Veys, Bülənd, Bünyad, Qəhrəman obrazlarının timsalında inqilab əsrinin oğullarını diqqət mərkəzinə çəkirdi. Bunlarla yanaşı, tənqidçinin atalara münasibəti də orijinallığı ilə fərqlənirdi.

Ataların cərgəsində Hatəmxan ağanın ("Hekayəti-müsyo Jordan həkimi- nəbatat və Dərviş Məstəli şah cadükuni-məşhur"), Hacı Səməd ağanın ("Bəxtsiz cavan") simasında "siyasətcil

atalar"ın, Cənnətəli ağa ("Adı var, özü yox") kimi "adı qalıb, özü olmayan" ataların, Rüstəm bəy ("Müsibəti Fəxrəddin") kimi zülmət səltənətinin atalarını, Hacı Abdulla ("Nadanlıq") kimi özünə oxşayan oğullar yetişdirmək istəyən ataların, Nəcəf bəy ("Dağılan tifaq") kimi ötən günlərin həsrəti ilə yeni cəmiyyətə uyğunlaşa bilməyən ataların adını qeyd edirdi.

Məsud Əlioğlunun "Atalar və oğullar" probleminin kökünü XIX əsrlə bağlamasının müəyyən səbəbləri var idi. İlk səbəb janrın yaranma tarixi ilə bağlıdır. O, bu problemin araşdırılmasına dramaturgiya ilə başlayırdı. Azərbaycan dramaturgiyasının yaranması XIX əsrdə baş verdiyinə görə problemin başlanğıcını bu dövrdən götürürdü. İkinci səbəb kimi tarixi şərait nəzərə alınmalıdır. XIX əsrdə Rusiya İmperiyasının verdiyi qərarlar bir sinif kim bəyliyə qarşı yönəlmişdi. İmperiyasının sahibkarlıq hissini boğmaq cəhdi mülkədar ataların nüfuzunu məhdudlaşdırırdı. Belə bir şəraitdə yeni quruluş gənc nəslin diqqətini çəkir, onların fikirlərinə, düşüncələrinə təsir edirdi. Bunun nəticəsində sələf-varis münasibətlərində yeni təzahürlər ortaya çıxırdı. Oğul yeni quruculuq işlərinin tərəfdarı, ata isə köhnə qanunlarla yaşayan mülkədar kimi təsvir edilirdi. Yazıçılar bundan bir vasitə kimi istifadə edir, ədəbiyyata yeni bir mövzu gətirirdilər.

XIX əsrdə, XX əsrin əvvəllərində və XX əsrin 30-cu illərindən sonrakı üç dövrü nəzərə almaqla, "Atalar və oğullar" məsələsi barədə belə bir sxem qura bilərik:

"Fərd ↔ Fərd" "Cəmiyyət ↔ Fərd" "Cəmiyyət ↔ Cəmiyyət" "Fərd ↔ Fərd" sxemi onu göstərir ki, burada oğulun mübarizəsi ictimai mahiyyət daşısa da, tək fərdin mübarizəsi şəklindədir. XX əsrin əvvəllərində yazılan əsərlərdə ataların yerində cəmiyyət dayanırdı. Yəni oğulu təmsil edən fərd mövcud cəmiyyətə qarşı mübarizə aparırdı. İnqilab məfhumunun bədii ədəbiyyata təsiri atalar və oğullar arasındakı münasibətin arealını genişləndirdi. Əvvəllər ata köhnəliyin, oğul isə yeniliyin tərəfdarı kimi çıxış edirdisə, Sovet ədəbiyyatında əsas diqqət müsbət qəhrəman yaratmaq olduğu üçün eyni əsərdə bu məqsədə xidmət göstərən ataları və oğulları görmək mümkün idi. Tənqidçinin iki nəsil arasındakı münasibəti inqilab çərçivəsində təhlil etməsi yeni atalar nəslini ortaya çıxarırdı. Artıq bu münasibətdə yeni bir xətt – "Cəmiyyət ↔ Cəmiyyət" konflikti görünür, oğulların cərgəsinə keçən atalar nəsli yetişirdi.

Məsud Əlioğlu Şahbaz bəyi və Hacı Nurunu yeni oğullar nəslinin ilk qaranquşu hesab edir, onların simasında dövrün ümumi mənzərəsini yaradırdı. Tənqidçi belə qərara gəlirdi ki, təhsil, elmlə bağlı bir islahat aparmayan Şahbaz bəyin düşüncələri, elm, xarici dil öyrənmək istəyi maarifçi gəncə yaraşan bir cəhətdir. Tənqidçinin Şahbaz bəylə müqayisədə Hacı Nuruya daha çox rəğbəti hiss olunur. Nuxuluların mənfi əməllərini üzə çıxaran bir gəncin fikirlərinə aydınlıq gətirməklə, "atalar və oğullar" arasında olan münasibətin vacib məsələsinə diqqəti yönəldirdi. Köhnəliklə yenilik arasında mübarizə o demək deyildir ki, ata mütləq mənfi, oğul mütləq müsbət obraz olacaq. Faydalı işlərlə məşğul olan tərəf yeniliyin daşıyıcısıdır.

O, yeniliyə maraq göstərən Şahbaz bəyin qarşısında duran maneəni bir neçə mərkəzdə təhlil edir, əsas mərkəzdə mühafizəkarlığı müdafiə edən mühiti götürürdü. İkinci maneə kimi Hatəmxan ağanı təhlilə cəlb edirdi. Onun Hatəmxan ağaya yanaşma tərzi fərqlidir: "Elə məsələnin mürəkkəbliyi də orasındadır ki, Hatəmxan ağa mühafizəkarlığını çox incə boyalarla, təsirli vasitələrlə həyata keçirir. Hatəmxan ağanın şəxsində dramaturq, mühafizəkar "atalar"ın xüsusi bir qoluna mənsub ağıllı, "işgüzar" bir bəy surəti yaratmışdır. Bu tipli "atalar" sözdə, bəzəkli nitqlərdə yeniliyə tərəfdar çıxan, konkret işə, fəaliyyətə gəldikdə isə Şəhrəbanı xanımların dünyagörüşündən bir addım da olsun uzağa getməyən mühafizəkarlardır" (Əlioğlu, 1964: 9). Tənqidçinin "tədbirli və siyasətcil ata" ifadəsi obrazın mahiyyətini tam şəkildə açmırdı. Çünki əsərin maarifçi qəhrəmanı Şahbaz bəyin istəkləri dövr üçün yeni idi. Hatəmxan ağanın ikili mövqeyi obrazın tərəddüd keçirməsindən irəli gəlirdi. Məsələyə digər tərəfdən yanaşdıqda, Hatəmxan ağa hüquqları əlindən alınmış bəy deyildi ki, siyasət işlətsin, şəxsi azadlığı itirmək qorxusu olsun.

Bədii əsərlərdə Avropa ölkələrində təhsil alıb Vətənə qayıdan, şüurca dəyişən oğulların təsvirinə geniş yer verilirdi. Məsud Əlioğlu müxtəlif əqidə ilə Vətənə qayıdan oğulları üç qrupda sistemləşdirirdi. Birinci qrupa Fəxrəddin ("Müsibəti-Fəxrəddin"), Ömər ("Nadanlıq"), Fərhad ("Bəxtsiz cavan") kimi XIX əsrin mühitində fəaliyyət göstərən oğulları, ikinci qrupa isə İsgəndər, Aydın, Oqtay kimi XX əsrin yetirmələrini, üçüncü qismə isə inqilab əsrinin oğullarını daxil edirdi. Bu qruplaşdırma şərti xarakter daşısa da, obrazların mahiyyətinə vardıqda görürük ki, oğulları bir-birinə yaxınlaşdıran cəhətlər çoxdur.

İnkişaf etmiş ölkələrin mədəniyyəti ilə tanış olan bu dövrün oğullarının atalara qarşı mübarizəsi iki şəkildə özünü göstərirdi. Birinci qismə daxil olan oğullar açıq şəkildə öz öyrəndiklərini tətbiq etməyə çalışırdı. Bu cəhətdən Fəxrəddinlə Fərhadın inkişaf yoluna nəzər salan tənqidçi onların keçirdikləri hisslərə, faydalı işlərə, eyni zamanda öz qüvvələrinə inamsızlığına, ruh düşkünlüyünə görə bənzərlik görsə də, son nəticədə məqsəd aydınlığına, öz əməllərində konkretliyinə görə Fərhada üstünlük verirdi. Fərhad kimi bir obrazın dramaturqun vaxtında ədəbiyyata gətirməsini Nəcəf bəy Vəzirovun realizmi ilə əlaqələndirirdi. Məsud Əlioğlu bu oğulları birləşdirən cəhətləri belə ümumiləşdirirdi: "Oğulların müsibəti onda idi ki, ictimai mühit onları qarşılamağa, başa düşüb qiymətləndirməyə hazır vəziyyətdə deyildi. "Oğulların" əqidəsi, hiss və fikirləri yaşadıqları həyatdan yüksəkdə dururdu" (Vəliyev, 1959a: 197). Tənqidçinin təhlillərində ataların taleyi ilə bağlı gəldiyi yekun qənaət reallığa əsaslanırdı: "Ataların müsibəti ondadır ki, doğma övladlarını öz şəxsi mənfəətlərinə qurban verirlər və yalnız o zaman ayılırlar ki, iş işdən keçmişdir" (Vəliyev, 1959a: 197).

XIX əsrin əvvəllərində başqa bir mənzərə ortaya çıxır. Bu əsrdə qələmə alınan qəhrəmanlar yeni yolla gedirdilər. Onlar mübarizəni aktiv yox, passiv şəkildə aparırdılar. Məsud Əlioğlu bu dövrün oğullarını "qəribə adamlar" nəsli adlandırırdı. "Qəribə adamlar" deyəndə tənqidçi bu gənclərin qeyri-adi, anlaşılmaz vəziyyətini nəzərdə tuturdu. Tənqidçinin "qəribə oğulları" anlaşılmaz vəziyyətə salan səbəbləri mənəvi qatda axtarması real cizgiləri əhatə edirdi. Həqiqətən də, XX əsrin oğulları ataları ilə psixoloji aspektdə mübarizə aparırdılar. Psixoloji qat o zaman üzə çıxırdı ki, onlar dərk etdiklərini açıq şəkildə müdafiə etmir, orijinal etiraz şəkli tapırdılar. Tənqidçi bu ziddiyyəti həqiqətə uyğun təsvir edirdi: "Beləliklə də qüvvətli bir mənəvi təzad yarandı: olduğu kimi görünməmək, həqiqi simanı gizlətmək. Bu tipli ziyalılar odlu hisslərini zorla boğdular və zahirdə çox laqeyd və soyuq görkəm aldılar. Xarakterdə gedən bu təbəddülat "qəribə adamlar"ın hamısı üçün səciyyəvi bir hal idi" (Əlioğlu, 1964: 70).

Tənqidçi "qəribəlik" əhvalına tutulan İsgəndər, Aydın, Oqtay kimi gənclərin ruhi sarsıntılarının səbəbini düzgün izah etmişdir. O, bunu xalq üçün çırpınan təmiz qəlbli ziyalılara cəmiyyətdə hörmət edilməməsi, bunun əksinə olaraq, öz şəxsi mənfəətini xalqın mənafeyindən üstün tutan adamların nüfuz qazanması ilə əlaqələndirirdi. İsgəndər, Aydın, Oqtay kimi gənclərin ümumi bir qrupda təhlil edilməsini düzgün hesab edirik. Çünki onları birləşdirən cəhətlər çox idi. Hər üçü keflilik xəstəliyinə tutulub həqiqət axtarışına çıxmışdılar. Məsud Əlioğlu da təhlillərində bu cəhətə xüsusi diqqət yetirirdi. O, əsərin əvvəlində "Məni hər kəs görməli, tanımalıdır, çünki mən bir həqiqətəm, mən bir heç deyiləm" (Cabbarlı, 2005: 197) deyən Aydının əsərin sonunda "Artıq mən bir həqiqət deyiləm, mən bir heçəm" (Cabbarlı, 2005: 241) deməsini qəribəlik əhval-ruhiyyəsinə tutulan oğulların uğursuz taleyi ilə bağlayırdı. İsgəndərin dilindən səslənən "Mən heç bir şeyəm" (Məmmədquluzadə, 2004: 428) ifadəsini obrazın cəmiyyətə qarşı etirazının kinayəli nəticəsi kimi dəyərləndirirdi. Məsud Əlioğlu İsgəndər və Aydın surətini qarşılaşdırır və bu nəticəyə gəlirdi ki, "İsgəndər qurtardığı yerdən Aydın fəaliyyətə başlayır" (Vəliyev, 1959b: 172).

Oqtayın inkişaf yoluna nəzər salsaq görərik ki, o, İsgəndər və Aydından fərqlənirdi. Onun qarşısında böyük bir ideal dayanırdı. O, bu arzusuna qovuşmaq üçün əvvəlcə açıq şəkildə mübarizə yolunu seçirdi. Lakin zaman keçdikdə axtardığı həqiqətin süniliyindən yorulur, qəribə oğullar cərgəsinə qoşulurdu. Daxili sarsıntı keçirən Oqtay isə "Qoy bu şaşqın bəşəriyyət bir dəfə də olsa həqiqəti görsün, görsün ki, o bir heçdir" (Cabbarlı, 2005: 288) deyərək həqiqətin yoxluğundan intiqamını alırdı. Həqiqət axtarışına çıxan Oqtayın aqibəti idealı, arzuları məhv olan əməlpərvər gənclərin bizə tanış olan sonunu göstərirdi. Bu gənclərin ruhi böhran keçirməsinin, daxili süqutunun nəticəsi idi ki, "qəribə adamlar" özlərini heçlik mərtəbəsində görürdülər. Məsud Əlioğlunun da oğullara bu istiqamətdə yaxınlaşması və eyni qrupda təhlil etməsi real və doğru qənaət idi.

Qəribə oğullar öz etirazlarını kefli şəkildə bildirirdilər. Bu onların cəmiyyətdəki ədalətsizliyə qarşı etirazlarının orijinal ifadə forması idi. İstər Aydının, istərsə də İsgəndərin mənəvi alkoqolluğu haqqında Məsud Əlioğlunun fikirləri doğruluğu ilə diqqəti cəlb edirdi: "Bütün həqiqətlərə göz yuman, bütün xəyalları həqiqət görən zavallı bəşəriyyətin" dərdini çəkmək üçün yalnız hissləri keyləşdirən, şüuru dumanlandıran bir vasitə var ki, o da içkidir. Lakin bəla orasındadır ki, "qəribə adamlar" içki qəbul etdikdən sonra nəinki sakitləşirlər, əksinə, daha qızğın olurlar, hər şey onlara əslində olduğu kimi görünür" (Əlioğlu, 1964: 89).

Məsud Əlioğlunun əsas məqsədi ata ilə oğulu qarşı-qarşıya qoymaq deyildir. Onu iki nəsil arasında gedən münasibətləri, bədii əsərlərdə qaldırılan bu problemin mahiyyətini üzə çıxarmaq maraqlandırırdı. Buna görə də ataların izi ilə gedən oğullar da tədqiqatdan kənarda qalmırdı. Bu zaman iki bir-birinə oxşayan, lakin mahiyyət etibarilə tamam başqa məna kəsb edən iki anlayış diqqətimizi cəlb edir:

1. Kef fəlsəfəsi
2. Keflilik fəlsəfəsi

Mülkədarlığın bir sinif kimi süquta doğru getməsi, xüsusilə, Rusiya İmperiyasının bu istiqamətdə apardığı tədbirlər bədii əsərlərin də aparıcı mövzusuna çevrilmişdi. Tənqidçi Əbdürəhim bəy Haqverdiyevin "Dağılan tifaq" əsəri vasitəsilə mülkədarlığın dağılmasının obyektiv və subyektiv səbəblərini izahına çalışmışdır. O, obyektiv amil kimi tarixi şəraiti, subyektiv amil kimi isə "kef" fəlsəfəsini diqqətə çatdırırdı. Bu məqamda "kef" fəlsəfəsi ilə "keflilik" fəlsəfəsi arasındakı fərqi üzə çıxarması tənqidçinin bədii əsərin incəliklərinə dəyər verdiyini göstərirdi. Məsud Əlioğlunun tədqiqatlarından bu iki anlayış arasındakı fərqi belə müəyyənləşdirə bilərik:

1. "Kef" fəlsəfəsi obrazı ciddi məsələlərdən uzaqlaşdırırsa, "Keflilik" fəlsəfəsi daha çox dərdləri artırırdı.
2. "Kef" fəlsəfəsi bayağı alkoqolizmi göstərirdisə, "Keflilik" fəlsəfəsinin mahiyyəti dərin idi, mənəvi qata gedib çıxırdı.
3. "Kef" fəlsəfəsi zərərli düşüncə tərzindən gəlirdisə, "Keflilik" fəlsəfəsi bir etiraz forması idi.
4. "Kef" fəlsəfəsi məqsədsizlik arqumentlərini daşıyırdısa, "Keflilik" fəlsəfəsinin mahiyyətində böyük bir məqsəd dayanırdı.

Tərbiyə və mühit amili atalar və oğullar arasında münasibətin aydınlaşdırılmasında doğru yanaşma idi. Çünki düzgün tərbiyə gələcək nəslin sağlam əsaslarla inkişafında mühüm rol oynayırdı. Məsud Əlioğlu Nəcəf bəy Vəzirovun "Ev tərbiyəsinin bir şəkli" əsərinin mülkədar atası Bayraməli bəyin timsalında yanlış tərbiyə üsulunu tənqid edir, "Əsl tərbiyə necə olmalıdır?" sualına cavab verir, atanın övlad üçün nümunə olması fikrini bəyənirdi. Tənqidçinin bəyliyə, mülkədarlığa bu şəkildə yanaşması dövrün tələbi ilə bağlı idi. İlk baxışda ideologiyanın maraqlarına xidmət etdiyi qənaəti yaranırdı. Lakin tənqidçi fikirlərinin mahiyyətinə vardıqda fərqli nəticələr üzə çıxır. Məsud Əlioğlu Vəzirovun mövqeyini müdafiə etsə də, öz mövqeyini də nümayiş etdirməyi unutmurdu: "Bəyliyin müəyyən təbəqəsi içərisində ardıcıl tərbiyə, qarşılıqlı hörmət, biri digərini anlamaq kimi gözəl insani sifətlər vərdiş halına düşmədiyinə görə Ataların da, oğulların da halı fənadır, dözülməzdir" (Vəliyev, 1959a: 184). Onun bu sözləri sosioloji təhlilin prinsiplərindən kənara çıxırdı. Yəni, o, bəyliyi bir sinif olaraq təhlil etmir, fərdi olaraq yanaşır, bu xüsusiyyəti bütün bəyliyə şamil etmirdi.

Məsud Əlioğlu atalar ilə oğullar arasındakı münasibətdən söz açarkən "böyüyə hörmət" məsələsinin üzərində dayanırdı. Belə ki, XX əsrin "qəribəlik" əhvalına tutulan oğulları xalq üçün çalışır, köhnəliyə qarşı etiraz edə bilirdilər. XX əsrin elə oğulları da var idi ki, Vətənə yad ruh gətirmişdilər. Məsud Əlioğlu onları "daxili düşmənlər" adlandırırdı. O, oğulların yeni ruh gətirmək üçün atalara qarşı mübarizəsini dəyərləndirərkən ata sevgisinin vacibliyini qabardırdı. "Anamın kitabı" əsərinin üç bir- birinə yad oğlunu ona görə tənqid edirdi ki, onlar Vətənə "yeni ruh" deyil, "yad ruh" gətirmişdilər. Deməli, tənqidçi oğulların ataların ənənələrinə sadiq qalmaqla yenilik yollarını müəyyənləşdirməyi əsas sayırdı. Fəxrəddin, Fərhad, Aydın, Oqtay kimi oğulların yenilik uğrunda mübarizəsi xalq sevgisindən irəli gəlirdi. Eyni zamanda, onların öz atalarına qarşı mübarizəsi hörmət çərçivəsindən kənara çıxmırdı. "Anamın kitabı" əsərinin "oğulları" isə Vətən, xalq sevgisinin nə olduğunu dərk etmirdilər. Məsud Əlioğlu ona görə də onları "yadlaşmış oğullar" kimi dəyərləndirirdi.

Azərbaycan ədəbiyyatında Nəcəf bəy Vəzirovun "Sonrakı peşmançılıq fayda verməz" əsərində "Analar və qızlar" məsələsi ətraflı şəkildə qələmə alınmışdır. Köhnəliklə yeniliyin mübarizəsi şəklində təhlil olunan bu məsələdə köhnəni qaynana Fatma xanım, yenini isə gəlin Sərvinaz təmsil edirdi. Əslində burada üçüncü bir xətt ortaya çıxır: Oğul. Məsud Əlioğlu da "qayınana-gəlin" konfliktini münaqişə xəttinin həlli yolunu oğulda axtarırdı. Oğulun yeni nəslin nümayəndəsi kimi özünə düzgün yol tapa bilməməsini, cəsarətsiz, iradəsiz hərəkətlərini mühitin dərdi kimi dəyərləndirirdi. Oğul nə qədər sabitlik yaratmağa çalışsa da, ananın gözündə günahkardır. Çünki

yeninin gəlişi köhnənin nüfuzuna təsir edirdi. "Gəlin-qaynana" konflikti arasında qalan oğulun çıxış yolunu Sibirə qaçmaqda tapmasını mühafizəkar ailə-əxlaq qanunları ilə bağlayırdı.

Məsud Əlioğlunun qaynana və gəlin münasibətlərinə az yer ayırmasının səbəbi bu məsələnin problem səviyyəsinə yüksəlməməsidir. Məsələnin məişət çərçivəsində həll edilməsi "atalar və oğullar" probleminin qlobal xarakterinə uyğun gəlmirdi. Ailə daxilində həll edilən problemlərin ictimai xarakter daşımaması bu məsələnin problem səviyyəsində araşdırılmasına əsas vermirdi.

Məsud Əlioğlu yalnız ata və oğul arasında baş verən konfliktdən bəhs etmir, bu mübarizəyə köhnəliklə yeniliyin mübarizəsi kimi baxırdı. Bunun səbəbi tənqidçinin fəaliyyət göstərdiyi dövrlə bağlı idi: "Sosialist mütəfəkkirləri isə bu konflikti ictimai mübarizə müstəvisinə gətirirlər - Ata mürtəce konservativ köhnəliyi, oğul isə proqressiv yeniləşməni təmsil edir və bu ata-oğul mübarizəsi sadəcə yeniliklə köhəliyin savaşından başqa bir şey deyil… Deməli ata inkişafa mane olan mənfi ünsür, oğul isə inkişafa çalışan və müsbət ideyaların daşıyıcısı kimi çıxış edir" (Fəhmi, 2018).

Sovet ədəbiyyatının müsbət qəhrəman yaratmaq ənənəsinin romanlar vasitəsilə tədqiqata cəlb edilməsi Məsud Əlioğlunun atalar və oğullar probleminin həllində doğru istiqamət idi. Xüsusilə, XX əsrin 30-cu illərindən sonra yazılan "Şamo", "Studentlər", "Dünya qopur", "Yoxuşlar", "Qəhrəman" romanlarında yeni əsrin qəhrəmanlarını yetişdirən mühit və mühitin "atalar" və "oğullar"ı ətraflı şəkildə təhlilə cəlb olunmuşdur. Yeni dövrün qəhrəmanları öz köklərinə bağlı olsalar da, müəyyən məqamlarda inqilab əsrinin yetirmələri kimi əcdadlarından fərqlənirdilər.

Partiyanın "Ədəbi-bədii təşkilatların yenidən qurulması haqqında" 1932-ci il qərarı sənətkarların qarşısında yeni tələblər qoymuşdu. Bu dövrdə sosializm realizmi prinsiplərinə xidmət edən əsərlərin yazılması mövzu və problematikanı dəyişirdi: "Normativ estetika zəminində yüksək bədii nümunələrdən tutmuş sxematik ədəbiyyata qədər ədəbiyyat bir dəfə müəyyənləşmiş əsas mövzular ətrafında (inqilabi gerçəklər, proletariatın qəhrəmanlıq mübarizəsi, sosializmin qələbə pafosu, kommunist partiyasının müdrikliyi və s.) yaranır, eyni sosializm dəyərlərinə münasibətdə funksional olur. Son dərəcə ağır ideoloji mühit-stalinizm epoxası (1930-50-ci illər) ədəbi əsərlərin səciyyə və səviyyəsinə mənfi təsir göstərir, burda izlər buraxır" (Əlişanoğlu, 2006: 13).

Məsud Əlioğlu inqilab əsrinin "atalar və oğullar" probleminin ilk olaraq Süleyman Rəhimovun "Şamo" romanı ilə başladığı qənaətinə gəlirdi. Əsərin qəhrəmanı Alo kişinin "Poçt qutusu" hekayəsinin obrazı Novruzəli və "Danabaş kəndinin əhvalatları" povestinin obrazı Məmmədhəsən əmi ilə müqayisə edilməsi dövrün ümumi mənzərəsi haqqında ətraflı məlumat verirdi. O, Alo kişi kimi qeyrətli, igid, müdrik ata obrazının yaradılmasını sosializm realizmi metoduna yiyələnən sənətkarın (Süleyman Rəhimovun – N.M.) qələminin bəhrəsi kimi səciyyələndirir, müti, yazıq Novruzəli, Məmmədhəsən əmi kimi obrazların təsvirini isə tənqidi realizmin nümayəndələrinin yaradıcılığındakı məhdudluqla əlaqələndirirdi. Məsud Əlioğlunun bu barədə fikirləri belədir: "Klassik realist ədəbiyyat tənqidi metoda yiyələndiyindən, yalnız ifşa etməklə, köhnəliyi, geriliyi, mənfi halları satira atəşinə tutmaqla kifayətlənmişdi. Bu ədəbiyyatda müsbət səciyyəli, qabaqcıl fikirli "atalar" haqqında ötəri bir məlumat da yox idi. Əlbəttə, bu hal həmin realizmin zəifliyi və bu realizmə əsaslanan yazıçıların həyatı birtərəfli göstərmələri, xalq həyatı ilə hərtərəfli tanış olmamalarının nəticəsi idi" (Əlioğlu, 1964: 138).

Məsələyə sosializm realizmi çərçivəsindən yanaşan müəllifin qeyd etdiyi xüsusiyyətləri tənqidi realizmin məhdud cəhətləri ilə əlaqələndirmək doğru deyildir. Çünki hər bir cərəyanın öz tələbi var idi. Bir metodun prizmasından yanaşaraq digər metodun xüsusiyyətlərinə münasibət bildirilməsi, hətta onlar arasında müqayisə aparılması xüsusiyyətlərinə həmin dövrdə tez-tez rast gəlmək mümkün idi. Məmməd Arifin "Sosialist realizmi sovet ədəbiyyatının əsas yaradıcılıq üsuludur" məqaləsində həmin fikirlərə təsadüf edirik: "Tənqidi realizm yazıçıdan əsas etibarilə "mühakimə etməyi", tənqid etməyi, həyat haqqında ittihamnamə çıxarmağı tələb edirdi. Ona görə də, biz oradan ancaq "həyat belə olmalıdır, bu pisdir, bu rəzalətdir" sözlərini eşidirik. Köhnə tənqidi realizmin xəyalları qüvvətli olsa da, qanunları zəif idi; arzusu böyük olsa da, imkanı kiçik idi" (Arif, 1958: 200).

Məsud Əlioğlu nə qədər sosioloji təhlilin sərhədlərindən uzaqlaşmağa çalışsa da, öz təhlillərində Sovet dövrünün əsas yaradıcılıq metodu olan sosialist realizmin prinsiplərinə əsaslanırdı. Özündən əvvəlkini inkar etmək bu metodun mahiyyətində dururdu. Buna görə də burada müsbət və mənfi

qəhrəman məsələsi, köhnəliklə yeniliyin mübarizəsi qabardılırdı. Nəzərə almalıyıq ki, "Romanların, pyeslərin, hətta poemaların konfliktini "müsbət" insanların sosioloji mübarizələri təşkil etdi və həmin "mənfi"-"müsbət" təsnifatını bədii-etik-psixoloji meyarlar deyil, siyasi meyarlar müəyyənləşdirirdi.

Yəni hakim ideologiyanı təcəssüm etdirən surət "müsbət" idi və o, "mənfi" ola bilməzdi, bu ideologiyaya yad hərəkətlərə yol verən isə heç vəchlə "müsbət" surət ola bilməzdi" (Elçin, 2010: 36-37).

Tənqidçinin "Studentlər" romanına müraciət etməsi də səbəbsiz deyildi. Belə ki, bu əsərin gənc qəhrəmanları öz köklərinə bağlı idilər. Müəllifin də bu gəncləri XIX əsrə bağlaması real görsənirdi. Bu cəhətdən tənqidçinin bu sözləri dövrün əsas cizgilərini üzə çıxarırdı: "Bununla belə "Oğullar" "Ataları" yalnız təqlid etmirlər. Qidalandıqları, tərbiyə aldıqları, təsirləndikləri zəminə, adət və ənənələrə, yeni keyfiyyətlər də əlavə edirdilər. Onların da özlərinə məxsus fikirləri, əxlaqi görüşləri münasibətləri var idi... Bu yalnız "Babalar həyatının müasir şəkli idi" (Əlioğlu, 1961a: 211). Müəllifin bu sözləri mövcud reallığı əks etdirirdi. Belə ki bu əsərdə Sovet ədəbiyyatının obrazlarını görməklə yanaşı, əvvəlki dövrün oğullarına da təsadüf etmək mümkündür. Rüstəm bəyin, Əlinin simasında Oqtay, Aydın kimi gənclərin izlərini görə bilərik. Fəraməz, Qulamrza, Cəfər kimi gənclər tüfeyli həyata meyil edən gəncləri təmsil edirdi. Məsud Əlioğlu yeniliyi, inqilabi gerçəkliyi Salman və Əhmədin simasında cəmləşdirirdi. Onun əsas tədqiqat obyekti Rüstəm bəy obrazı idi.

Məsud Əlioğlunun uğuru ondan ibarət idi ki, obrazların mahiyyətini açmaq üçün müqayisəli təhlilə üstünlük verirdi. Bu da təhlilin aydınlığına gətirib çıxarırdı. O, "Studentlər" romanının obrazı Rüstəm bəyi "Anamın kitabı" əsərinin Rüstəm bəy obrazı ilə qarşılaşdırırdı. Bir sıra oxşarlıqların olmasına baxmayaraq, hər iki obrazı bir-birindən ayıran cəhətləri müəyyənləşdirmək baxımından müəllifin bu sözləri obrazların daxili aləminin açılmasına xidmət edirdi: "Əvvəlki Rüstəm bəy doğma ananın "yadlaşmış oğlu" idisə, bu Rüstəm bəy "yad ellərdə" yaşamasına baxmayaraq, doğma "ana, Vətən" haqqında düşünən namuslu oğul idi" (Əlioğlu, 1961a: 213).

Məsud Əlioğlu silsilə şəklində çap etdirdiyi "Atalar və oğullar" məqaləsinin adı simvolik mahiyyət daşıyır. Burada fikirlərin mübarizəsi məsələsi diqqətə çatdırılır. Ataların dedikdə Mehri xanım, Fatma xanım kimi analar da nəzərdə tutulur, oğulların sırasında Gülbahar kimi gənc qızlar da iştirak edirdi. Bu da onu göstərir ki, müəllif problemin həllində cins və yaşa əhəmiyyət vermir. Halbuki "atalar və oğullar" dedikdə, ilk öncə yaşlı nəsillə gənc nəsil arasındakı münasibət yada düşür. Problemin həllində tənqidçinin bu sözləri məsələnin mahiyyətini açmış olur: "Deməli, zamanın və həyatın qabaqcıl, faydalı və əməli əhəmiyyəti böyük olan məsələlərini, fikirlərini kimin necə və nə şəkildə dərk etməsi həlledici amildir. Yaş fərqinin və həyat təcrübəsinin isə o qədər əhəmiyyəti yoxdur" (Əlioğlu, 1964: 56).

## Nəticə

Məsud Əlioğlunun təhlillərindən "Atalar və oğullar" problemi ilə bağlı aşağıdakı nəticəyə gəlmək olar:

1. "Atalar və oğullar" arasında münasibət Azərbaycan ədəbiyyatında geniş şəkildə işlənən mövzulardandır.
2. Bu məsələnin problem səviyyəsində qoyuluşu XIX əsrlə bağlıdır.
3. Bu mövzu Sovet ideologiyasının prinsiplərinə cavab verirdi.
4. Bu problem yeniliklə köhnəliyin mübarizəsi şəklində təzahür edirdi.
5. Müsbət qəhrəman məsələsi ön plana çıxarılmışdır.
6. Bu mövzu Avropa ədəbiyyatından keçmişdir.
7. Bu mövzuda yazılan əsərlər tarixi gerçəkliyi tam şəkildə əks etdirmirdi.

Hər bir əsər yarandığı dövrün bədii məhsuludur. Sənətkarın əsərdə qaldırdığı problem yazıçı qələminin bəhrəsi olsa da, tarixi şəraitin izlərini də özündə cəmləşdirir. Buna görə də tədqiqat aparan müəllif müraciət etdiyi əsərin mahiyyətinə toxunmadan onu təhlil etməyi bacarmalıdır. Tənqidçi çalışmalıdır ki, həm yazıçı mövqeyini müdafiə etsin, həm də obyektivlik gözlənilsin. Məsud Əlioğlunun "Atalar və oğullar" probleminə yanaşmasında bu vəzifənin öhdəsindən gəldiyi açıq-aşkar görünür.

Nəticə olaraq deyə bilərik ki, ədəbiyyatda özünü göstərən "Atalar və oğullar" problemi dövrün tələbindən irəli gələn bir problemdir, burada iki nəsil arasındakı münasibətdən söhbət gedir. Müasir dövrün prizmasından baxdıqda Rusiya imperiyasının və Sovet dövrünün hakim olduğu illərdə ədəbiyyatda qabarıq şəkildə göstərilən bu tipli mövzulara həmişə yaşıl işıq yandırılıb.

## Ədəbiyyat

1. Vəliyev, M. (1959). Atalar və oğullar. "Azərbaycan" jurnalı, №11.
2. Vəliyev, M. (1959). Atalar və oğullar. "Azərbaycan" jurnalı, №12.
3. Əlioğlu, M. (1961). Atalar və oğullar. "Azərbaycan" jurnalı, №2.
4. Əlioğlu, M. (1961). Atalar və oğullar. "Azərbaycan" jurnalı, №3.
5. Vəliyev, M. (1955). Həqiqətə çevrilmiş arzular. Bakı: Azərbaycan, №10.
6. Əlioğlu, M. (1964). Ədəbiyyatda yeni insan. Bakı: Azərnəşr.
7. Cabbarlı, C. (2005). Əsərləri. 4 clddə, II cild. Bakı: Şərq-Qərb.
8. Məmmədquluzadə, C. (2004). Əsərləri. 4 cilddə, I cild. Bakı: Öndər.
9. Fəhmi, İ. (2018). Atalar və oğullar. "Ədəbiyyat" qəzeti, 13 yanvar.
10. Əlişanoğlu, T. (2006). XX əsr Azərbaycan nəsrinin poetkası. Bakı: Elm.
11. Arif, M. (1958). Ədəbi-tənqidi məqalələr. Bakı: Azərnəşr.
12. Elçin. (2010). Sosrealizm bizə nə verdi?. Bakı: Mütərcim.

Gönədərildi: 13.06.2022 Qəbul edildi: 30.07.2022

DOI: https://doi.org/10.36719/2706-6185/14/40-46

**Gumru Vasif Balakhanova**
Azerbaijan State Pedagogical University
PhD student
19_bq_91@mail.ru
Orcid: 0000-0002-1709-1442

# DETERMINATION OF MYCOBIOTA OF ANTHROPOGENIC ENVIRONMENTS GENERAL CHARACTERISTICS BY FREQUENCY

**Abstract**

In modern times, due to the rapid urbanization, construction works have reached a large scale. However, unfortunately, in the construction of new residential complexes, the standard norms of both construction and environmental conditions are almost not followed. In this regard, the analysis of ecomorphic fungi capable of living in different environmental conditions on the basis of topical and trophic criteria reflects their situation and trophic relationships even in the local ecosystem. Also, the fact that the ecosystems are not closed or are an open system allows fungi to migrate to the ecosystem in different ways, and their heterogenous groups belonging to separate systematic categories settle on different substrates and perform functional activities in unity. It is known that the ability of fungi to adapt to new environmental conditions and settle on the substrate is the basis for the formation of mycobiota in this or that ecosystem. It has been determined that microscopic fungi inhabiting buildings of various purposes not only deteriorate the quality of various objects and materials placed inside the rooms, but also have a very negative impact on the health of people living and working here. Therefore, the main goal of the conducted research was the mycological assessment of the ecological situation in new residential complexes.

***Keywords:*** *residential buildings, microscopic fungi, mycobiota, micromycete, pathogenicity*

**Qumru Vasif qızı Balaxanova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
doktorant
19_bq_91@mail.ru
Orcid: 0000-0002-1709-1442

## Antropogen mühitlərin mikobiotasının rastgəlmə tezliyinə görə ümumi xarakteristikası

**Xülasə**

Müasir dövrdə sürətli urbanizasiya ilə əlaqədar tikinti işləri geniş miqyas almışdır. Lakin, çox təəssüflər olsun ki, yeni-yeni yaşayış komplekslərinin salınmasında həm tikinti-konstruksiya, həm də ekoloji vəziyyətin standart normalarına demək olar ki, əməl olunmur. Bu baxımdan müxtəlif mühit şəraitlərində yaşamaq qabiliyyətinə malik olan ekomorf göbələklərin topik və trofik kriteriyalar əsasında analiz olunması, onların hətta lokal ekosistemdəki vəziyyətlərini və trofik əlaqələrini əks etdirir. Habelə, ekosistemlərin qapalı olmaması və ya açıq sistem olması, göbələklərin ekosistemə müxtəlif yollarla miqrasiyasına, onların ayrı-ayrı sistematik kateqoriyalara aid heterogen qruplarının fərqli substratları üzərində məskunlaşaraq, vəhdət halında funksional fəaliyyət göstərməsinə şərait yaradır. Məlumdur ki, göbələklərin yeni ekoloji şəraitə uyğunlaşması və substrat üzərində məskunlaşması qabiliyyəti mikobiotanın bu və ya digər ekosistemdə formalaşmasının əsasını təşkil edir. Müəyyənləşdirilmişdir ki, müxtəlif təyinatlı binalarda məskunlaşan mikroskopik göbələklər, nəinki otaqlar daxilində yerləşdirilən müxtəlif əşyaların və materialların xarab olaraq keyfiyyətinin aşağı düşməsinə, eyni zamanda burada yaşayan və çalışan insanların sağlamlığına da çox mənfi təsir göstərilmişdir. Odur ki, aparılan tədqiqatın əsas məqsədini də yeni yaşayış komplekslərində ekoloji vəziyyətin mikoloji qiymətləndirilməsi təşkil etmişdir.

***Açar sözlər:*** *yaşayış binaları, mikroskopik göbələklər, mikobiota, mikromiset, patogenlik*

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. İmpakt Faktor: 0.652. 2022 / Cild: 4 Sayı: 8 / 52-55 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. Impact Factor: 0.652. 2022 / Volume: 4 Issue: 8 / 52-55 e-ISSN: 2709-4197

Nizamnaməsinin qəbul olunması ilə müasir insan hüquqları rəsmiləşmiş oldu. Nizamnamənin 55-ci maddəsində qeyd olunurdu ki, "Birləşmiş Millətlər irqinə, cinsinə, dilinə və ya dini mənsubiyyətinə fərq qoyulmadan bütün insanların əsas hüquq və azadlıqlarına hamılıqla hörmət edilməsinə və riayət edilməsinə dəstək verirlər" (Hüseynova, 2018: 32). Xüsusilə, Nizamnamənin preambulasında insan hüquqlarının müdafiəsi BMT-nin başlıca məqsədlərindən biri olaraq göstərilmiş, həmçinin kişi və qadınların hüquq bərabərliyi məsələsinə də toxunulmuşdu. Dünyanın bir çox yerində qadınların hüquqlarının önəm kəsb etmədiyi bir dövr üçün qadın hüquqlarına olan bu cür yanaşma çox önəmli hesab olunurdu.1945-ci ildə BMT yaradıldıqdan sonra əsas məsələlərdən biri burada qadınların hüquq bərabərliyinin təmin oluması üzrə iş aparan daxili orqanın yaradılması idi. Buna görə 1946-cı ildə BMT-nin tərkibində İnsan Hüquqları Komissiyası və Qadınların Vəziyyəti üzrə Komissiya yaradıldı. 1947-ci ilin yanvar ayından etibarən İnsan Hüquqları Komissiyası İnsan Hüquqlarının Ümumi Bəyannaməsi üzərində çalışmağa başladı və 1948-ci ilin dekabr ayında bəyannamə tam hazır oldu. İnsan Hüquqları Komissiyasının ümumilikdə 18 üzvü var idi və bunun cəmi 2-si qadın idi. Bu şəxslərdən biri Hansa Mehta,digəri isə Komissiyanın sədri Eleanor Ruzvelt idi. Onların sonsuz səyi nəticəsində ilk dəfə olaraq bu bəyannamədə qadın hüquqlarının hərtərəfli ehtivasını görə bilərik. Dekabr ayının 10-da BMT-nin Baş Məclisi tərəfindən qəbul olunan İnsan Hüquqlarının Ümumi Bəyannaməsində mülki, siyasi, sosial və iqtisadi hüquqlar öz əksini tapmışdı (Deniz, 1998). Qadınların hüquq bərabərliyinin təmin olunmasında növbəti addım 1966-cı ilin dekabr ayında qəbul olunan Mülki və siyasi hüquqlar haqqında Beynəlxalq Pakt idi. Beynəlxalq Paktın III maddəsində qeyd olunurdu ki, "iştirakçı dövlətlərin hər biri Paktda qeyd olunan bütün mülki və siyasi hüquqlardan qadın və kişilərin bərabər şəkildə faydalanmasını təmin etməlidir". Həmçinin 26-cı maddədə yazılır: "Cinsi də daxil olmaqla digər xüsusiyyətlərindən asılı olmayaraq, bütün insanlar qanun qarşısında bərabərdirlər və heç bir ayrı-seçkiliyə məruz qalmadan bərabər şəkildə müdafiə olunmaq hüququna malikdirlər. Bu məsələ ilə bağlı ayrı-seçkiliyin bütün formaları qadağan edilməlidir". Mülki və siyasi hüquqlar haqqında Beynəlxalq Paktın qəbul olunması ilə paralel olaraq İqtisadi,sosial və mədəni hüquqlar haqqında Beynəlxalq Pakt da qəbul edilmişdi. Bu Paktın da III maddəsində qeyd olunurdu ki, "Paktın iştirakçı dövlətlərinin hər biri qeyd olunan iqtisadi, sosial və mədəni hüquqlardan kişi və qadınların bərabər şəkildə heç bir ayrı-seçkiliyə məruz qalmadan istifadəsini təmin etməlidir". Azərbaycan 1992-ci ildən bu Paktın iştirakçısıdır (5).

Qadın və kişilərin hüquq bərabərliyi ilə bağlı müxtəlif maddələr bu sənədlərdə qeyd olunsa da, qadınhüquqlarının tam şəkildə əks olunduğu ayrıca bir Beynəlxalq Konvensiyaya ehtiyac var idi. Məhz bununla bağlı olaraq işlər 1970-ci ildən etibarən daha da sürətlənməyə başladı. 1967-ci ildə Qadınlara qarşı ayrı-seçkiliyin aradan qaldırılması Bəyannaməsinin ardından 1979-cu ildə o dövr üçün böyük əhəmiyyət kəsb edən və sırf qadın hüquqlarının təminatından bəhs edən Qadınlara qarşı ayrı-seçkiliyin bütün formalarının ləğv olunması haqqında Konvensiya (CEDAW) qəbul olundu. CEDAW Konvensiyasını digər beynəlxalq sənədlərdən fərqləndirən əsas xüsusiyyət ondan ibarət idi ki, digər sənədlərdə ümumilikdə bütün insanlar üçün təmin olunan mülki, siyasi, iqtisadi, sosial və mədəni hüquqların hər biri burada məhz qadın üçün nəzərdə tutulmuşdu. Burada xüsusilə diqqət çəkən əsas məsələ "bərabərlik" kəliməsinin deyil də, davamlı olaraq "ayrı-seçkiliyin ləğv olunması" ifadəsinin işlədilməsi idi. Konvensiyanın əsas məqsədi qadınların cəmiyyətdə bərabər şəkildə öz hüquqlarındanistifadə imkanlarını təmin etmək və onları hər cür ayrı-seçkilikdən azad etmək idi (6).

CEDAW bəyannaməsi, şübhəsiz ki, qadınların insan hüquqlarının təmin olunması üçün ən önəmli beynəlxalq vasitədir. Bəyannamə ön söz və 30 maddədən ibarətdir. Bəyannamənin ön sözündə qadınlara qarşı olan ayrı-seçkiliyin insan ləyaqətinə qarşı hörmətsizlik olaraq dəyərləndirilir. Bəyannamədə qeyd olunur ki, qadın və kişilərin hüquq bərabərliyi yalnız o zaman təmin oluna bilər ki, cəmiyyətdə və ailədə kişinin ənənəvi rolu qadının rolu ilə dəyişdirilsin. Yəni qadının uşaq dünyaya gətirə bilməsi onun ayrı-seçkiliyə məruz qalması üçün səbəb olmamalıdır, uşaq böyütmək qadın və kişinin,eyni zamanda cəmiyyətin ortaq olaraq yerinə yetirməli olduğu bir vəzifədir (7).

Qadınlara qarşı ayrı-seçkiliyin nə anlama gəldiyini bəyannamənin I maddəsindən açıq şəkildə görə bilərik: Qadınların ailə vəziyyətindən asılı olmayaraq, qadın və kişi bərabərliyi əsasında siyasi, iqtisadi, sosial, mədəni və digər sahələrdə insan hüquqları və azadlıqlarının tanınmasına, istifadə olunmasına və həyata keçirilməsinə mane olan və ya bu məqsədi daşıyan cinsə bağlı olaraq edilən hər cür ayrı-seçkilik, məhrumiyyət və ya məhdudiyyət hesab olunacaqdır. Bəyannamənin II maddəsində qeyd olunur ki, bəyannaməni qəbul edən dövlətlər qadınlara qarşı hər cür ayrı seçkiliyi qınayır və bütün uyğun

yollardan istifadə edərək bu ayrı-seçkiliyi aradan qaldırmaq üçün xüsusi siyasət yeridəcəyinə söz verir. Bundan başqa bəyannamədə kənd ərazilərində yaşayan qadınlara da xüsusi dəstəyin göstərilməsi, evlilik və ailə hüququnda qadınlara da kişilərlə bərabər hüququn verilməsi, eyni zamanda qadının siyasi və ictimai həyatda seçib, seçilmə hüququnun, hökümət siyasətində iştirak etmə hüququnun olduğu və digər hüquq və azadlıqları qeyd olunmuşdur (8).

Qadınlara qarşı zorakılığın bütün formaları insan hüquqlarının kobud şəkildə pozulmasıdır. Beate Schöpp-Schilling'in yazısında qeyd edildiyi kimi, CEDAW komitəsi indiyə qədər 3 "Ümumi Tövsiyə", xüsusilə də 19 nömrəli Ümumi Tövsiyə ilə münasibətlər daxilində qadınlara qarşı olan zorakılığın beynəlxalq səviyyədə insan hüquqlarının pozulması və ayrı-seçkilik olaraq qəbul edilməsinə böyük töhvə vermişdir. Yalnız bunun qəbul edilməsindən sonra "xüsusi sahədə" daha çox kişilər tərəfindən qadınlara qarşı törədilən zorakılığın qarşısının alınması və cəzalandırılması üçün dövlətlərin məsuliyyət daşıması mümkün oldu. Bəyannamənin tərəf dövlətləri qadınları bu cür zorakılıq aktlarından qorumaq və buna məruz qalan qadınların həqiqətən belə bir şiddətdən uzaqlaşa bilmələri üçün mümkün şərtləri təmin etmək məcburiyyətindədirlər. Ailə münasibətləri də daxil olmaqla zorakılığın hər cür formasından uzaq yaşamaq hər bir qadın və qızın təməl insan haqlarıdır (9).

## Nəticə

Qadın hüquqlarının müdafiəsi XVIII əsrdə Avropada başlayan qadın hərəkatının və XX əsr feminizm hərəkatının təməli hesab olunur. Qadın hüquqları bir sıra ölkələrdə yerli adət-ənənələrə və qanunvericiliyə əsaslanaraq nizamlansa da,bəzilərin də isə ümumiyyətlə nəzərə alınmır. Məhz buna görə də, ümumi insan hüquqları kontekstində qadın hüquqlarının ayrıca vurğulanması vacibdir.

Ümumiyyətlə, qadınlar bütün tarixboyu, istər siyasətdə, istər məişətdə, istərsə də ictimai həyatda ayrı-seçkiliyə məruz qalmışdır. 1945-ci ildə BMT-nin yaradılmasından etibarən bu ayrı-seçkiliyin aradan qaldırılması və qadınların öz hüquq və azadlıqlarından tam şəkildə yararlana bilməsi üçün müxtəlif tədbirlər görülüb,bəyannamələr qəbul olunsa da, bugünkü dünyamızda qadınlar hələ də cinsi qısnamaya məruz qalmaqdadır. Psixoloji, cinsi, iqtisadi, fiziki zorakılığa məruz qalan qadınların sayı günü-gündən artmaqdadır. Bu da gender bərabərliyinin təmin olunmasının hazırkı dövrümüzdə aktual bir məsələ olduğunu göstərir (10).

## Ədəbiyyat

1. Akillioglu, T. (1995). Human Rights I.Concept Resources and Protection Systems, Human Rights Center Publications. Istanbul.
2. Berktay, F. (2004). The development of women's human rights and Turkey, Civil Society and Conference articles. Istanbul.
3. Hüseynova, H., Əliyev, Ə., Bayramova, P., Səfərov, E., Səfixanlı, A. (2018). Qadın hüquqlarının müdafiəsi: Beynəlxalq.
4. Deniz, D. (1998). Women's human rights and women's cases in the European court of human rights. Istanbul and national perspectives. Baku.
5. https://dergipark.org.tr/tr/download/article-file/884242
6. https://cins.ankara.edu.tr/13_5.pdf
7. http://www.anl.az/down/meqale/xalqqazeti/2010/mart/110436.htm
8. https://kadininsanhaklari.org/savunuculuk/uluslararasi-sozlesmeler-ve-mekanizmalar/cedaw/
9. https://dergipark.org.tr/tr/download/article-file/95911
10. https://www.coe.int/az/web/compass/convention-on-the-elimination-of-racism-and-discrimination

Göndərildi: 15.06.2022 Qəbul edildi: 18.08.2022

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. İmpakt Faktor: 0.652. 2022 / Cild: 4 Sayı: 8 / 56-60 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. Impact Factor: 0.652. 2022 / Volume: 4 Issue: 8 / 56-60 e-ISSN: 2709-4197

DOI: https://doi.org/10.36719/2706-6185/14/56-60

**Bəydaş Elçin oğlu Mirzəyev**
Azərbaycan Kooperasiya Universiteti
magistrant
baydash.mirzayev@gmail.com

# KOMMERSİYA BANKLARININ HƏYATA KEÇİRDİKLƏRİ KREDİT SİYASƏTİNİN ÖLKƏ İQTİSADİYYATINA VƏ SAHİBKARLIĞIN İNKİŞAFINA TƏSİRİ

**Xülasə**

Kommersiya bankları qanunvericiliyinin imkan verdiyi bütün əməliyyatları yerinə yetirirlər. Bank sisteminin fəaliyyət mexanizmində əsas rol kommersiya banklarına məxsusdur. Belə ki, məhz kommersiya bankları ölkədə kredit resurslarının əsas hissəsinin toplanmasına xidmət göstərir və müştərilərə maliyyə-kredit xidmətlərinin bütöv kompleksini təqdim edir. Bu gün kommersiya bankları müştərilərə 200 növə qədər müxtəlif bank xidmətləri göstərmək qabiliyyətinə malikdir. Bütün Kommersiya banklarının bəlli 2 funksiyası vardır: borc almaq və borc vermək. Borc almaq çox zaman əmanət şəklində, borc vermək isə kredit şəklində ortaya çıxır. Məhz kommersiya bankları ölkədə kredit resurslarının əsas hissəsinin toplanmasına xidmət göstərir və müştərilərə maliyyə-kredit xidmətlərinin bütöv kompleksini təqdim edir. Kommersiya banklarının fəaliyyəti ikili səciyyə daşıyır. Onlar kommersiya təşkilatı olmaqla yanaşı, həm də cəmiyyətin ictimai təsisatları kimi çıxış edir. Kommersiya təşkilatı kimi onlar maksimal mənfəət əldə etmək istiqamətində fəaliyyət göstərir.

***Açar sözlər**: bank, elektron bankçılıq, kreditlər, biznes kreditləri, kredit siyasəti, bank işi*

**Baydash Elchin Mirzayev**
Azerbaijan Cooperation University
master student
baydash.mirzayev@gmail.com

# The effect of the credit policy implemented by commercial banks on the country's economy and the development of entrepreneurship

**Abstract**

Commercial banks perform all operations allowed by the law. The main role in the functioning mechanism of the banking system belongs to commercial banks. Thus, it is the commercial banks that serve to collect the main part of the credit resources in the country and provide the clients with a whole complex of financial and credit services. Today, commercial banks have the ability to provide customers with up to 200 different types of banking services. All Commercial banks have 2 distinct functions: borrowing and lending. Borrowing often occurs in the form of deposits, and lending occurs in the form of loans. It is commercial banks that serve to collect the main part of credit resources in the country and provide customers with a whole complex of financial and credit services. The activity of commercial banks has a dual character. Besides being a commercial organization, they also act as public institutions of society. As a commercial organization, they operate in the direction of obtaining maximum profit.

***Keywords**: bank, electronic banking, loans, business loans, credit policy, banking*

## Giriş

Kredit anlayışı iqtisadi həyatda son dərəcə önəmlidir və kredit imkanları olmadığı bir maliyyə bazarı düşünmək olmaz. İqtisadi quruluş içərisində yer alan muəssisələrin hamısı, fəaliyyətlərini sağlam bir şəkildə davam etdirə bilmək və maliyyə strukturlarının pisləşməsinə imkan vermədən, balans hesabatlarını davamlı bir şəkildə qoruya bilmək üçün bəlli bir miqdarda kredit istifadə etməlidirlər. Bu vəziyyət kreditlərin, sektorial bazada olan önəmini artırmaqda və bunun nəticəsində də kreditin isdifadəsi ilə istehsal miqdarları arasında bir əlaqə ortaya çıxır. Kredit üçün geniş bir tərif müəyyən etmək mümkündür. Latıncada "inanma", "güvənmə" mənasına gələn kredit, "crede" sözünən yaranıb. Bu kəlmə "hörmət, etibar" kimi mənalara uyğun gəlir. Kredit ümumi olaraq, müəyyən bir zaman sonra

ödəmə vədi ilə; mal, xidmət, pul ilə satınalma gücünün təmin etmək ya da var olan satınalma gücünün müəyyən bir zaman sonra geri almaq üzrə başqa birinə təhvil verilməsi şəklində təsvir etmək olar. Başqa bir tərifə görə isə; kredit, tərəflərdən birinin, digər tərəfə vəsaitlərini qarşılıq istiyərək ya da istəməyərək borca verməyi qəbul etdiyi maliyyə və ya ticarət əməliyyatıdır (Abdullayev, 2002). Bankçılıq baxımında daha ətraflı bir tərif vermək lazım gələrsə, kredit; bir bankın edəcəyi araşdırma nəticəsində, fiziki və hüquqi şəxslərə qanunlar, daxili siyasəti və öz resursları nəzərə alınaraq, təminat qarşılğı və təminatsız olaraq pul, təminat və ya girov vermək şəklində bilinən imkan və məhdudiyyətlər olaraq təyin etmək olar. Ölkələrdə iqtisadi cəhətdən yüksəlişi təmin etmək baxımından kreditlər əvəz olunmaz maliyyə mənbələridir. Müəssisələr böyüyəbilmək üçün və inkişaf daha tez ayaq uydur bilmək üçün banklardan aldıqları kreditlərlə maliyyə ehdiyaclarını qarşılayırlar. Kreditlər tədavül vasitəsi olmaları sayəsində nağd pul hərəkətini azaltmaqda və ticarət əməliyyatlarını sürətləndirməkdədir. Kredit sistemi vasitəsilə istifadə olunmayan 22 vəsaitlər, kredit şəklində pula ehdiyacı olanlara verilir və vəsaitləri vasitəsilə gəlir əldə edilərkən, iqtisadiyyatda tələb təklif hərəkətliliyi təmin edilir (Bağırov, 2003). Kreditin təsfirinə baxmış olarsaq 4 əsas faktoru görə bilərik. Bunlar zaman, güvən, risk, gəlir və s. Zaman faktoru: Banklar tərəfindən borc verilən və ya təklif edilən pul və buna bənzər xidmətlərin, təyin edilmiş bir zaman müddətindı geri verilməsi lazımdır. Borc verilən kreditin müddəti uzandıqca, buna bağlı olaraq o kreditin riskidə artmaqdadır. Buna görə də, kredit əməliyyatlarında vəziyyət necə olursa olsun, zaman faktoru çox önəmlidir. Buna bağlı olaraq veriləcək kreditlər üçün müddət müəyyən edilərkən çox diqqətli olunmalı, ölkənin cari bazarının vəziyyəti diqqətə alınmalıdır. Güvən faktoru: Müxtəlif şəkillərdə verilən kreditlər, bəlli bir zaman sonra geri ödənilməsi şərti daşıdığından, krediti verən və alan tərəf arasında güvənə əsaslanan bir əlaqə olmalıdır. Krediti alan şəxsin və ya müəssisənin banklar baxımından nüfuzu və etibarlılığı çox önəmlidir. Unutmamaq lazımdır ki, güvən, veriləcək kreditlərdə ən önəmli faktordur. Risk faktoru: Ümumi olaraq maliyyə riski; maliyyə bazarlarında və ya əməliyyatlarda gözlənilən vəziyyət və ya nəticənin olmayacağı ehtimalıdır. Bankçılıqda isə risk, bankın müxtəlif gözlənilməyən səbəblərə görə zərər ilə qarşılaşması ehdimalıdır. Bu zaman risk ümumilikdə, kredit müqaviləsində verilən öhdəliklərin zamanında yerinə yetirilməməsi şəklində ortaya çıxar. Gələcəkdə ola biləcək bütün mənfi hallar, kreditin əvvəlcədən təyin edilmiş şəkildə geri ödənilməməsinə yol açacaqdır. Buna görə də, bankların fəaliyyətləri nəticəsində ortaya çıxan ən önəmli risk faktoru, kredit riskidir. Gəlir faktoru: Kredit, bankların və digər maliyyə kredit təşkilatlarının gəlirlə təmin edən ən mühüm aktiv fəaliyyətlərindən biridir. Çünki, banklar və digər kredit təşkilatları, kredit yolu ilə əldə etdikləri gəlirləri dəyərləndirərək faiz və kamissiya kimi önəmli gəlirlər əldə edirlər. Banklar, mövcud olan vəsaitləri və müxtəlif üsullarla əldə etdikləri 23 resurslar ilə faiz komissiyası və buna bənzər gəlirlərlə özünü təmin etməlidir. Bu ehdiyyacın əsas səbəbləri (Əkbərov, 2011):

- Aktivlərini saxlamaq və imkişaf etdirmək;
- Yiğdiqları əmanətlərə görə əmanət sahiblərinə qarşı olan məsuliyyətlərini yerinə yetirmək üçün;
- Bankın səhmdarlarını mənfəətlə təmin etmək.

Bankların resurs istifadəsində daha çox önəmə sahib olan kreditlərin, iqtisadi həyatın sistematik bir şəkildə sürdürülməsində bir çox önəmi vardır. Bu yararların ən önəmlilərini aşağıdakı şəkildə qeyd edə bilərik: 1 – Sənaye sahələrində fəaliyyət göstərən müəssisələrin; quruluşlarında, yaşamlarında və inkişaflarında kredit faktoru ən önəmli amillərdən biridir. Kreditlər eyni zamanda banklar inkişaf etməsi yönündən də çox önəmlidir. Çünki, ölkə iqtisadiyyatında yer alan investorların bəlli zamanlarda ehtiyaç hiss etmədikləri pul yığımı "depozit hesabı" olaraq banklarda toplanır və bankların vasitəçiliyi ilə ehdiyacı olanlar arasında bölüşdürülür. 2 – Əmtəə ehtiyyatların səmərəli və yararlı bir şəkildə istifadə olunmasında kredit anlayışı ən önəmli faktorlardan biridir. Istehsalçı, əldə etdiyi məhsulu, itsehsal etdikdən həmən sonra satmaq istəsə, bazarda baş verəcəyi gözlənilən təklif artıqlığı əmtəələrin və xidmətlərin qiymətlərini aşağı salmaqla istehlak dərəcələrini artıracaqdır. Bunun nəticəsində əldə qalan əmtəə ehtiyyatları tükənəcək, bazarda əmtəə qıtlığı yaşanacaq və buna bağlı olaraqda əmtəələrin qiymətləri yüksələcəkdir. Belə bir vəziyyətin yaranmaması üçün, pula ehdiyyacı olan isthesalçı, kreditdən istifadə edərək mətəə ehtiyyatlarını qoruyur və beləliklə zaman içərisində bazardakı tələb və təklif balansı yaranır. 3 – Kreditlər, məhsul istehsalı və xidmətlər üçün lazım olan alətlər, xammal, materiallar, enerji kimi zəruri olan maddələrin lazımı yer və zamanda təmin ediləbilməsi 24 üçün maliyyə dəstəyi verirlər və bunun sayəsində səmərəlilikləri artır. Bu yaranan vəziyyətin təsiri ilə milli istehsalın səviyyəsi yüksəlir (Əsgərova, 2007). Bankların müştərilərini çəkən önəmli xidmətlərindən biri

kreditlərdir. Bir düşünün, bu günkü vaxtda ehdiyac sahibi olan bütn insanlar banklara müraciət edirlər. Özəlliklə bu ehdiyacları yüksək məbləğlər təşkil edən zaman. Buna görə də banklar da bu barədə özlərini hər keçən gün dahada təkmilləşdirirlər və müştərilərinə ən sərfəli fürsətləri təqdim etmək üçün çalışırlar. Bu vəziyyət özəlliklə kommersiya bankları üçün keçərlidir. Bu cür bankların ilk məqsədi mənfəət əldə etmək olduğu üçün aralarında rəqabət başlayır və davamlı olaraq müşdərilərinə müxtəlif təkliflər irəli sürürlər. Ayrıca kreditlər təkcə fiziki şəxslər üçün yox həmçinin də müəssisə və təşkilatlar üçün də müxtəlif formaları vardır. Bankların hər bir təbəqəyə təklif etdiyi kredit xidmətləri bir çox mövzuda ehdiyyacların qarşısının alınmasına köməy olur. Düşündüyümüzdə ətrafımızda kredit borcu olmayan neçə nəfər insan var və ya hansı müəssisə və şirkətin kredit borcu yoxdurki. Ölkə iqtisadiyyatının gediçatı, ticarət fəaliyyətinin davamı, ixracat və idxalın davamlılığı kimi bir çox mövzuda önəm daşıyan bank kreditlərini növlərə ayırmaq mümkündür. Əslində bu mövzunu yığcamlaşdırmaq bir az çətindir. Çünki hər bir bankın fərqli-fərqli adlarla qarşımıza çıxan bir çox kredit növü vardır. Vəziyyət belə olduğu təqdirdə kreditləri müəyyən şərtlərlə ümumi olaraq qiymətləndirəcəm. Burada demək istədiyim kreditin sadəcə pulla verilə verilməməsidir. Yəni pulla verilməsi ilə yanaşı nağdsız olaraqda dəyərləndirilir. Buna görə də krediti strukturuna görə nağd və nağdsız formalara ayırmaq doğru olar (Həsənov, 2005). Nağdsız kreditlər: Kreditin bu növləri pul xaricində verilən; amma yenə də pulun yerinə keçə biləcək, təminatla bağlı vasitələrdir. Nağdsız kreditlər ticarət ilə məşğul olan müştərilər üçün nəzərdə tutulmuşdur. Çünki bir işin, ticarətin yada xidmətin edilməsi üçün nağd kreditlərin keçərli olmadığı vəziyyətlərdə ola bilər. Daha aydın şəkildə desək nağdsız kreditlərin verilməsinin uyğun olduğu zamanlarda nağdsız kreditlər istifadə edilir. 25 Bu növlər isə təminat məktubları və akkreditivlər şəklindədir. Bunların sayəsində banklar öz müştərilərini qarantiyası altına alır və onlara müəyyən məhdudiyyətlər təyin edilməsinə imkan verir. Yaranacaq hər hansı bir neqativ hal zamanı məsuliyyət bankların üzərində olur (Məmmədov, 1997). Nağd kreditlər: Nağd pul şəklində ehdiyyac sahiblərinə verilən və ən çox istifadə olunan kredit növüdür. Nağd pulla verilən kreditlərinin məqsədi mal və xidmət almaq üçün nağd pulun istifadə edilməsidir. Yəni bankın sizə nağd olaraq verdiyi bir mövcud məbləğ vardır. Bunun üçün də banka faiz dərəcəsi qarşılığında əlavə vəsait ödəyirsiniz. Faiz dərəcəsini isə pulu istifadə etdiyiniz və bəlli bir zaman sonra geri ödədiyiniz üçün verirsiniz. Nağd kreditlər haqqında ümumi məlumat bu şəkildədir. Müddətinə görə də kreditlər bir birindən fərqlənirlər. Bunlar aşağıdakılardır: Qısa müddətli kreditlər: Bu cür kreditlərin müddəti 1 ildən qisadır. Yəni maksimum müddətin 1 ildən qısa olması lazımdır. Ödəmə planı yaradılarkən də 1 il içərisində geri ödəniləcək şəkildə həyata keçirilir. Orta müddətli kreditlər: Orta müddətli kreditin müddəti bankdan banka dəyişiklik göstərə bilər. Bəzi banklar 1 il ilə 5 il arası müddət ilə, bəziləri isə 1 il ilə 10 il arasında təyin edir kreditin müddətini. Ancaq ümumi olaraq orta müddətli kreditin müddəti 1 il ilə 5 il müddəti arasında dəyişir. Uzun müddətli kreditlər: Orta müddətli kreditin zamanı dəyişiklik göstərdiyi üçün təbii olaraq uzun müddətli kreditlərədə yansıyır. Burada da bəzi banklar 5 il və daha çox müddətə, bəziləri isə 10 il və daha uzun müddətə krediti verir. Nağdsız formada verilən kreditlərə bənzər bir kredit də girov qoymaqla əldə edilən kreditlərdir. Burada da qarşımıza girovsuz şəkildə verilən və girovla verilən kreditlər çıxır. Girov göstərilərək verilən kreditlərdə banklar özlərini güvəndə his etmələri üçün həyata keçirirlər. Yəni verilən kreditlərdə bəzi təminatların göstərilməsi lazımdır (Məmmədov, 2001). 26 Girov vasitəsilə verilən kredit: Bu cür krediti istifadə etmək istəyən müşdərilər qarşılığında bir mal, daşınmaz əmlak kimi girovlar göstərir və bunlara əsasən kredit verilir. Bank özünü qarantiye almaq üçün belə bir şərtlər qarşısına qoyur kredit götürən müştərilərin. Girovsuz açıq şəkildə verilən kreditlər: Banklar bu cür kreditləri güvəndikləri müştərilərinə verir. Müəyyən bir sənəd və imza qarşılığında bu kredit verilir. Əslində baxıldıqda bir çox kredit bu şəkildə olur. Bu zaman müşdəri banka qarşı bütün mülkiyyət varlığı ilə məsuliyyət daşıyır. Açıq olmasının səbəbi budur. Hər hansı məhdud təminat yoxdur və müşdəri əlində olan bütün hər şeyə qarşılıq bu krediti istifadə edir. İnsanların və müəssisələrin banklara olan kredit tələbləri fərqli məqsədlər daşıyır. Kreditlər də buna görə formalaşır və bir çox növü ortaya çıxır. İnvestisiya-Dəstək kreditləri: Müxtəlif investisiyalar, proyektlər və sahibkarları dəstəkləmək üçün verilən kredit növüdür. Bu kreditlər üçün ən çox üstün tutulan banklar investisiya banklarıdır. Layihələri dəstəkliyərək investorlara maliyyə qaynaqları təklif edərlər və beləliklə investisiya kreditinin növləri ortaya çıxar. Biznes fəaliyyətinin davaç etdirilməsi üçün verilən kreditlər: Müəssisə və şirkətlər tərəfindən istifadə olunan kreditlərin demək olar ki, hamısı buna aiddir. Müəssisələr kommersiya fəaliyyətlərini davam etdirebilmələri üçün

günlük, həfdəlik, aylıq, illik istifadə etdiyi kreditləri ifadə edir. Ehdiyyacların qarşılanması üçün verilən istehlak kreditləri: Bu cür kreditləri çox zaman fərdi müştərilər istifadə edir. Kreditin növlərinin geniş bir əhatə diarəsinə yayılmış olması, bir çox vasitələrin kredit üçün xidmət etdiyini bizə göstərir. Bunlar bank şuraları tərəfindən təyin edilir (Aslanov, 2002). Kreditlərdə istifadə olunan bu vasitələr isə təminat məktubu, girvov, çeklər, veksellər, istiqrazlar, akkreditiv və əlbəttə ki, pulla verilən nağd kreditlərdir. Nağd maliyyə mənbələri; istiqrazlar, veksellər kimi alətlətlər fərdi müştərilərin istifadə etdiyi 27 növlərdirsə, digərləri kommersiya fəaliyyəti ilə məşğul olan müştərilərin istifadə etdiyi və ticarətdə önəmli mövqeyə sahib olan alətlərdir. Nəticə olara fərdi və korporativ müştərilərin müxtəlif ehdiyyaclarını qarşılanması üçün var olan kredit növləri, məqsədlərə uyğun istifadə olunur. Bunun sayəsində ehdiyyaclar, xəyallar, kommersiya fəaliyyətləri problemsiz bir şəklidə həyata keçirilir. Vacib olan burada hansı kreditin hansı bankdan daha sərfəli alabilməkdir. Buna görə də kredit götürərkən araşdırmalısınız və ən sərfəli şəkildə seçim etməlisiniz. Beləliklə ehdiyyaclarınızı daha rahat və sərfəli şəkildə qarşılaya bilərsiniz. Bəzi tədqiqatçılar sərt pul siyasəti və bank kreditləri arasındakı əlaqəni araşdırmağa çalışmışlar. Sərt pul siyasətinin tətbiq edildiyi ilk dövürlərdə bank kreditləri asda bir şəkildə irəliləməkdə idi. Ancaq xarici tədqiqatçılardan olan Bernanke və Blinder, siyasət dəyişikliyindən sonrakı altı-doqquz həftə içərisində bankların qiymətli kağızlarını yaratmaqa başladıqları və işsizlik faizlərindəki bir yüksəlmək ilə bərabər kreditlərin tədircən azaldığı qənaətinə gəlmişlər. Oxşar emirik nəticələr Nakamura (1988), Romer (1990), Kashyap və Stein (1991) tərəfindən də həmçinin müəyyən edilmişdir. Bernanke və Blinder bunun əsas kredit kanalları yanaşması ilə uyğun gədiyini nəzərə çatdırmış, sərt pul siyasətinin kreditlərin aşağı enməsinə səbəb olduğunu və xərclərin durğunlaşdırdığını ortaya çıxartmışdır. Kredit təklifinin aşağı enməsi nəticəsində kredit tələb edənlər, alternativ kredit mənbələlərinə yönələcəklərdir. Bu nöqtədə bank kreditlərinin başqa kredit qaynaqları ilə əvəz edilə bilməsi böyük önəm daşımaqdadır. Bir iqtisadiyyatda vəsait təklif edənlər və vəsait tələb edənlər arasındakı qarşılıqlı əlaqənin olduğu açıq aşkar aydındır. İqtisadi baxımdan mövzular fərqli şəkillərdə həll olunsa da, təməlində müsbət və ya mənfi olaraq qarşılıqlı əlaqədə olduqları və ya bir birlərinə təsir etdikləri müşahidə olunur. Vəziyyət belə olduqda iqtisadiyyatda kreditlərin önəmi danılmazdır. 28 Sağlam bir bank sistemi güclü bir iqtisadiyyatın ən önəmli ünsürlərindən birisidir, buna görə də yararı sadəcə bankın müştəriləri ilə məhdudlaşmır. Bankçılıq sistemi əmanətlərin toplanmasına və bu vəsaitlərin səmərəli investisiyalara cəlb edilməsinə vasitəçilik edir. Yeni avadamlıqlar və texnologiyalara edilən investisiyalar iqtisadi böyümə və yaşam standartlarının yüksəldilməsində təkan verici qüvvə kimi çıxış edər. Həqiqətəndə keçən əsrlərdəndə görüldüyü kimi bank sisteminin infrastrukturunun yaradılmasında ölkələrin əsas məqsədi iqtisadi göstəricilərin yaxşılaşdırılması olmuşdur (Mişkin, 2021).

Dünyanın hər yerində olduğu kimi kommersiya bankları qanunvericiliyin izin verdiyi əməliyyatları həyata keçirirlər. Ümumi olaraq götürsək kommersiya banklarının apardığı əməliyyatlar 3 qrupa ayrılır:

1) aktiv əməliyyatlar 2) passiv əməliyyatlar 3)vasitəçilik əməliyyatları. Kommersiya banklarının aktiv əməliyyatları deyildikdə hər kəsin bildiyi kimi gəlir əldə etmək üçün kommersiya banklarının öz vəsaitini və yaxud da kommersiya banklarına cəlb olunmuş vəsaitləri kredit şəklində istifadə edilməsi nəzərdə tutulur. Kommersiya banklarının bu əməliyyatlarında öz müştərilərinə ssuda verir və müəyyən müddətdən sonra faizlə birlikdə geri alınması nəzərdə tutulur. Aktiv əməliyyatları yerinə yetirərkən kommersiya bankları cəlb edilmiş vəsaitləri ehtiyacı olanlar arasında bölüşdürür və burada kreditor rolunda çıxış edir. Hər bir bankda olduğu kimi kommersiya bankındada əsas məqsəd mənfəət əldə etməkdir və kommersiya bankları mənfəət əldə etmək üçün bu əməliyyatlardan istifadə edirlər. Azərbaycandakı kommersiya banklarının gəlirli fəaliyyət göstərməsi kredit əməliyyatlarından asılıdır (Əsgərova, 2007). Kredit əməliyyatı pul vəsaitlərinin müvəqqəti istifadə üçün qaytarılmaq şərti ilə və ödənilməsi şərti ilə yerləşdirilməsində borc verən və yaxud kreditor və borc alan yəni debitor arasındakı münasibətdir. İqtisadiyyatda kapitalın kapitalın dövr etməsi nəticəsində sahibkarların əlində olan sərbəst pul vəsaitləri istifadə edilməlidir. İstehsal prosesi zamanı əsas kapital bütünlüklə istifadə edilir, öz dəyərinin bir qismini yeni yaradılmış əmtəəyə ötürür. Dövriyyə kapitalının iqtisadiyyatda hərəkəti zamanı müvəqqəti pul yaranır. Yeni məhsul alınana kimi həmin pul sahibkarın əlində qalır toplanır və bu pul istifadə edilməzsə ve olduğu yerdə qalarsa heçdə sahibkara gəlir gətirməz. Bunun üçün də bankların apardığı kredit əməliyyatları bazar iqtisadiyyatı şəraitində vacibdir. Sahibkarlar banklardan əldə etdiyi krediti hər hansı istehsala qoyurlar əldə etdikləri mənfəətin bir hissəsini menimsəyir digərini isə kredit götürdükləri banka faizlə ödəyirlər. Banklar müştərilərdən sərbəst pulları aşağı faizlə qəbul edir yüksək

faizlə verirlər və mənfəət əldə edirlər. Mənfəətlə yanaşı dövlətin iqtisadiyyatının inkşafınada böyük təsir bağışlayır (Sadıqov, Balayeva, Həmişəyeva, 2003).

Müasir şəraitdə bazar iqtisadiyyatına keçid dövründə yeni-yeni müəssisələrin yaranması ilə bank kreditinə olan tələbat xeyli yüksəlmişdir. İnzibati-amirlik dövründə fəaliyyət göstərən banklar dövlətə aid idi və dövlətin vəsaiti hesabinə fəaliyyət göstərirdilər. Müasir dövrdə bankların xüsusi vəsaitləri ilə yanaşı əlavə vəsaitlərə də ehdiyyac yaranmışdır. Onların bank kreditlərindən istifadə etməsi nəticəsində aktiv əməliyyatların bir növü olan kredit əməliyyatlarının digər əməliyyatlara nisbətdə ön plana çıxmasına və xüsusi çəkisinin artmasına səbəb olmuşdur. Bu da kommersiya banklarının maliyyə nəticələrində kreditləşmə əməliyyatlarının əhəmiyyətini ön plana çıxarır (Sadıqov, 2003).

Ölkəmizdə sahibkarlıq fəaliyyətinin inkişafı üçün Prezident İlham Əliyevin həyata keçirdiyi islahatlar, tapşırıqlar, tövsiyələr, sahibkarlara verilən güzəştli kreditlər nəticəsində regionlarda kreditləşmənin faizi yüksəlmişdir. Son illərə nəzər yetirsək Respublikamızda olan yerli sahibkarlara verilən güzəştli kreditlərin həcmi milyon manatlarladır. Əvvəlki illərdə ən çox güzəştli kreditlər paytaxtda və iri rayonlarda fəaliyyət göstərən sahibkarlara verilirdisə indiki dövürdə iqtisadiyyatın inkişafı və s regionlarda sahibkarlığın inkişafını zəruri etdi. Elə buna görə də, Cənab Prezident İlham Əliyevin regionların sosial-iqtisadi inkşafına dair siyasəti öz töhfəsini verdi və indiki dövürdə regionlarmızda olan sahibkarlar da güzəştli kreditlərdən yararlana bilirlər (13).

## Nəticə

Kommersiya banklarının yerinə yetirdikləri əməliyyatlar həm iqtisadiyyatın həm də, bankın gəlirlilik səviyyəsinə çox böyük təsir göstərir. Banklar yerinə yetirdikləri əməliyyatlar vasitəsilə öz nizamnamə kapitalını yaradır, ehtiyacı olanlara kreditlər verir və iqtisadiyyatın canlanmasında çox əhəmiyyətli işlər görür. Banklar həyata keçirdikləri əməliyyatlara düzgün bank siyasəti tətbiq etməklə gəlirlilik səviyyəsini və yerinə yetirdikləri əməliyyatların daha da müasir vəziyyətə gətirərək təkmilləşdirilməsini təmin edə bilərlər. Ona görə də, bankların yerinə yetirdikləri əməliyyatların düzgün şəkildə idarə edilməsi bankın gələcəyi üçün və ölkə iqtisadiyyatı üçün əvəzolunmazdır (14).

## Ədəbiyyat


1. Abdullayev, Ş. (2002). Azərbaycan Respublikasında bank resurslarının idarə olunması. Sank-Peterburq.
2. Bağırov, M. (2003). Banklar və bank əməliyyatları. Bakı.
3. Əkbərov, M. (2011). Elektron kommersiya. Bakı.
4. Əsgərova, R. (2007). Pul, Kredit və Banklar. Bakı
5. Həsənov, Ə. (2005). Müasir beynəlxalq münasibətlər və Azərbaycanın xarici siyasəti. Bakı.
6. Məmmədov, S. (1997). Bank işi. Bankirin stolüstü kitabı. Bakı.
7. Məmmədov, Z. (2001). Beynəlxalq valyuta-kredit münasibətləri və xarici ölkələrin pul-kredit sistemi. Bakı.
8. Aslanov, A. (2002). Maliyyə və bank statistikası. Bakı.
9. Mişkin, F. (2021). Pul, Bank və maliyyə bazarlarının iqtisadiyyatı. Bakı.
10. Sadıqov, M., Balayeva, E., Həmişəyeva, Ş. (2003). Beynəlxalq valyuta kredit münasibətləri və xarici ölkələrin pul-kredit sistemi. Bakı.
11. Sadıqov, M. (2003). Xarici ölkələrin pul-kredit sistemi. Bakı.
12. www.cbar.az
13. www.economy.gov.az.


Göndərildi: 04.06.2022 Qəbul edildi: 13.08.2022

# İÇİNDƏKİLƏR



İmzalandı: 26.08.2022
Formatı: 60/84, 1/8
H/n həcmi: 7,75 ç.v.
Sifariş: 552

https://aem.az saytında çap olunub.
**Ünvan:** Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
"Azərbaycan" nəşriyyatı, 6-cı mərtəbə.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: info@aem.az